Görün dinləmək nə qədər önəmlidir ki, böyük bir iş adamı dinləməyi öyrənmək üçün böyük bir institut istəyir. Sitatda "fail to realize" mürəkkəb feili çox diqqət çəkicidir, çox götür-qoy etdikdən sonra onu "önəm vermirlər" anlamında "fərqinə varmırlar" təqdim edirik.

İşgüzar ünsiyyət zamanı danışan və dinləyən ağıllı bir dost olarsa, gözəl bir dialoq ortaya çıxar. Bu zaman onların ürəkdən gələn sözü qurucu bir gücə sahiblənərək, maqnit kimi onları bir-birinə çəkər. Danışılan sözlər qurucu, yenilikçi, yönləndirici, həvəsləndirici olduğundan onlar dinləyəni yenidən qurur (yeniləndirir), faydalı və ürəyə yatan informasiyalarla onun zehnini gərildir və genəldir. Dostlar arası dinləmənin önəmini qabardan amerikalı psixiatr və yazar Karl Menninger (1993-1990) vurğulayır ki (3):

***Listening is a magnetic and strange thing, a creative force. The friends who listen to us are the ones we move toward. When we are listened to, it creates us, makes us unfold and expand.***

*Dinləmək – maqnit sayağı və qəribə bir şeydir, yaradıcı bir gücdür. Bizi dinləyən dostlar onlara doğru getdiyimiz dostlardır. Onlar bizi dinləyərkən, bu bizi qurub-yaradır, bizi açır və genişləndirir.*

Dinləmək, danışmaq, davranmaq insan həyatında prioritet qazanan özəlliklərin üçüdür. Dinləmək maraqla olsa – sevgiyə, danışmaq düz olsa – güvənə, davranmaq doğru olsa – sayğıya yol açır. Əgər birisi problemi anlamaq üçün dinləyirsə, demək, onu çözmək üçün yardım etmək istəyir. Əgər birisi problemin içinə varmadan cavab verirsə, onun qaydaya düşməsinə başdansovdu yanaşır. Göründüyü kimi, dinləmənin, danışmanın, davranmanın doğru bir axında olması üçün bu üçünə güc verən niyyət saf və doğru olmalıdır. Niyyət təkcə sadalanan üçünün deyil, həyatda olan hər prosesin ilk səbəbidir. 2018-ci ildə dünyasını dəyişən ingilis kökənli zinbabviyalı siyasətçi Roy-Leslie Bennett dinləmənin niyyətlə bağlılığından söz açarkən yazır (4):

***Listen with curiosity, speak with honesty, act with integrity. The greatest problem with communication is we do not listen to understand, we listen to reply. When we listen with curiosity, we do not listen with the intent to reply, we listen for what is behind the words.***

*Maraqla dinləyin, düz danışın, doğru davranın. Ünsiyyətdə ən böyük problem budur ki, anlamaq üçün dinləmirik, cavablamaq üçün dinləyirik. Biz maraqla dinləyərkən cavablamaq niyyəti ilə dinləmirik, sözlərin arxasında nə olduğunu bilmək üçün dinləyirik.*

Həyatda uğurlu insanlar çoxdur, onların arasında hər sənət və peşə sahibləri var. Dərindən analiz etsək, görərik ki, onların əksəriyyəti danışmaqdan çox dinləyən kəslərdir. Düzdür, uğur qazanmanın yolları çoxdur, amma mütləq anlamda onlardan biri danışmaqdan çox dinləməkdir. Bu yanaşma hər işgüzar kommunikasiyada rastlanan bir prosesdir. Danışmaqdan çox dinləməyə üstünlük verən uğurlu amerikan maliyyəçisi, dövlət adamı, 1965-ci ildə vəfat edən alman kökənli Bernard Baruç vurğulayır (5):

***Most of the successful people, I have known, are the ones who do more listening than talking.***

*Tanıdığım uğurlu insanların çoxu danışmaqdan çox dinləyən kəslərdir.*

İnsan təkcə insanı dinləmir, təbiətdə olan bütün canlı və cansız varlıqları, hətta Tanrını dinləyə bilər. Onların hamısı öz dilləri ilə insanla danışırlar. Demək, təbiətdə danışmayan heç nə yoxdur. Hər bir insan tənhalığa çəkilib Tanrı ilə öz ürəyində danışa bilər, Onun göndərdiyi mesaj, xəbər və müjdələri ala bilər. Tanrını dinləmənin ən qısa yolu qəlbi qırıq (üəryi incidilmiş) olmaqdır. Belə insan üçün Tanrı həm bir doktor, həm də bir atadır, başqa sözlə, ürəyini müalicə edən bir doctor, onun göz yaşını silən bir atadır, onu himayə edən bir gücdür. İnsan bədənində Tanrının anılma yeri yalnız onun qəlbidir. Tanrı bircə qəlbə eniş edir, informasiyaları da ora ötürür, insanın qalan heç bir orqanı ilə Onun kontaktı olmur. Bir doktor və bir ata olan Tanrını dinləməyi insanlara tövsiyə edən, 1987-ci ildə doğulan amerikan şairi və müğənnisi Kriss Jami vurğulayır (6):

***Listen to God with broken heart. He is not only the doctor who mends it, but also the father who wipes away the tears.***

*Tanrını qırıq bir qəlblə dinləyin. O, təkcə qəlbi sağaldan həkim deyil, eyni zamanda göz yaşlarını silən atadır.*

İnsanlar arası münasibətlərdə hər proses "öyrətmə, iş qurma, icra" adlı üç praktik mərhələdən keçir. Bu üçü bir-biri ilə sıx bağlıdır, biri olmadıqda qalan ikisi yetərli olmur. Öyrətmə işində motivasiya, bilik və informasiya ötürülür, bacarıq və vərdiş aşılanır, uğur gətirən yollar açıqlanır, o

yollara çatmanın motivləri göstərilir. İş qurma mərhələsində nəzəri və praktik biliklərə dayanaraq konkret bir işin özülü qoyulur, onun irəliləməsi üçün plan qurulur. İcra mərhələsində isə əldə oluanan praktik sonuclar reallaşır və konkret uğurlara yol açılır. 2012-ci ildə dünyadan köçən amerikalı yazar və iş adamı Stefen-Riçards Kovey "öyrətmə-iş qurma-icra" işlərində dinləmənin aparıcı olduğunu belə açıqlayır (Covey, 1989: 302):

***One of the most important elements in teaching, conducting and performing – all three – is listening.***

*Öyrətmədə, idarəetmədə və icrada – hər üçündə - ən önəmli ünsürlərdən biri dinləməkdir.*

Dinləmə aktiv və qeyri-aktiv olmaqla iki qola ayılır. Aktiv (dərin) dinləmə bir sənət örnəyi olub, danışana dəyər və sayğı ötürür. Aktiv dinləyənin məqsədi təkcə sözləri eşitmək deyil, danışanın nonverbal (sözlü olmayan) gizli üz ifadələrini oxuyaraq, səmimi (ürək ovunduran) bir qayğıkeş olaraq danışanın niyyətini dinləmək üçün bütün diqqətini ona yönəldir. Bu yolla danışanla aktiv dinləyən arasında ünsiyyət, söhbət və münasibət dərinləşir, sonda da aktiv dinləyən başqalarında dinləmə bacarığını tərbiyə edən bir modelə (örnəyə) dönür. Aktiv dinləmənin dərinliklərini açıqlayan amerikalı motivasiya xanım yazarı Emilia Hardman yazır ki (Hardman, 2012: 50):

***The art of active listening makes the speaker feel valued and respected. In making a conscious effort to not only hear the words, but to listen to the speaker's intent by reading nonverbal clues, and by being genuinely caring, your communication and conversations become deeper and so do your relationships. When you listen this way, you foster the skill of active listening in others by acting as a model for effective and positive communication.***

*Aktiv dinləmə sənəti danışana dəyərli və sayğılı olduğunu hiss etdirir. Şüurlu bir səy göstərərək, yalnız sözləri eşitmək üçün deyil, həm də danışanın niyyətlərini dinləmək, mimik və jest ipuçlarını oxumaq və səmimi qayğı göstərməklə ünsiyyətiniz və söhbətləriniz və həmçinin danışanla münasibətləriniz daha da dərinləşir. Bu şəkildə dinlədiyiniz zaman siz effektiv və pozitiv ünsiyyət üçün bir model kimi davranaraq, başqalarında aktiv dinləmə bacarığını tərbiyə edirsiniz.*

Dinləmə və danışma iki əsas ünsiyyət vasitələridir. Bu sıralamada "dinləmə" öndə, "danışma" ondan sonra durur. Bu da danışma ilə müqayisədə dinləmənin daha önəmli olmasından xəbər verir. Ünsiyyət quran insanlar bu ikisindən yerli-yerində, məqamında, düzgün yararlansalar, heyrətamiz, böyüyüb artan, yaddaşlarda qalıcı olan münasibətlər yaranacaq. Ancaq yanlış yararlansalar, yaxşıya yol açan dinləmə və danışma pisə yol açacaq – münasibətlərin ziyanına, itkisinə və hətta çökməsinə gətirib çıxaracaq. Bento Leal adlı amerikalı yazar "Effektiv kommunikasiya üçün 4 ən önəmli açar" kimi tərcümə etdiyimiz "4 Essential keys to effective communication" kitabında yazır (Leal, 2017: 64):

***Listening and speaking are the basic communication tools we use every day. We use them to process language as we interact with the people in our lives. When we use these tools well, they help us create wonderful, growing, lasting relationships. However, when used improperly, these very tools of listening and speaking can create a lot of hurt, damage, and even destruction to relationships.***

*Dinləmək və danışmaq hər gün istifadə etdiyimiz əsas ünsiyyət vasitələridir. Həyatımızdakı insanlarla təmas halındaykən bu vasitələrdən dili işlətmək üçün istifadə edirik. Bunlardan yaxşı istifadə etdikdə onlar möhtəşəm, inkisaf edən, davam edən əlaqələr qurmağımıza kömək edirlər. Ancaq yanlış istifadə etdikdə münasibətlərin ziyanına, itkisinə və hətta çökməsinə gətirə bilər.*

İnsan dinləyərkən öyrənir, istər informatik, istər elmi baxımdan. Əgər dinlədiyi ədəbdən kənar sözlər olsa, yenə öyrənir, onlardan özünə ibrət almaqla. İnsanın həyatdakı missiyası təkcə yemək, içmək və insan sayının artmasına xidmət etmək deyil, həm də ömür boyu öyrənmək və öyrətməkdir. Öyrənmə və öyrətmə ülvi bir missiya olub, insanı faydalı bir fərd edir, onun həyatına hər zaman nur çiləyir.

Qarşısındakı insana söz haqqı vermək duyğu və ifadələrini bildirməyə şans yaratmaq, üstəlik, onun dediklərini təmkinlə dinləmək bir ədəb örnəyi olmaqla yanaşı, informasiya almaqdır, biliyə sahiblənməkdir, başqa sözlə, yeni nəsə öyrənməkdir. Göründüyü kimi, biri anladır, biri də anlayır. Bu anlatma və anlama danışandan çox dinləyənə xeyir verir. Dinləmə ilə danışma arasındakı bu sıx

əlaqənin önəmini heç zaman unutmaq olmaz. “Az söylə - çox dinlə”, “İki dinlə - bir söylə”, “Söyləyən yox, dinləyən arif olar” kimi atalar sözləri nahaq yerə deyilməyib ki. Unutmayaq ki, dinləmək təkcə öyrənmək deyil, həm də qazanmaqdır. 1932-ci ildə doğulan, yəhudi kökənli amerikan yazarı və iş adamı Harvey Makay doğru olaraq vurğulayır ki, dinləyən bir insan həm öyrənir, həm də qazanır – təkcə pul yox, saygı da (10):

***You learn when you listen. You earn when you listen – not just money but respect.***

*Dinlədikcə öyrənirsiniz. Dinlədikcə qazanırsınız – təkcə pul yox, hörmət də qazanırsınız.*

Dinləmək, baxmaq, danışmaq insanı bütün canlı varlıqlardan üstün etmək üçün Tanrının ona verdiyi ali özəlliklərin üçüdür. 13-cü əsr dahi sufi şairi Mevlana Rumi bu sıralamanın başında dinləməni qoyaraq, “dinləmə-baxma-danışma” üçlüyünün mahiyyətini, onların insana niyə verilməsinin səbəbini açmaqdan ötrü dinləmə üçün tolerantlıq (başqalarına dözümlülük), baxma üçün şəfqət (başqalarının ağır durumuna ürəyi yanma), danışma üçün sevgi təyinlərini ayırıb. Demək, dinləmə yaxşıdır, tolerantlıqla olsa – ən yaxşıdır, baxma yaxşıdır, şəfqətlə olsa - ən yaxşıdır, danışma yaxşıdır, sevgi ilə olsa - ən yaxşıdır. Yeddi əsr öncə tolerantlıq, şəfqət, sevgi insana xas duyguların başında durduğu kimi, indinin özündə də onlar duyğuların lideridir və bəşər durduqca lider qalacaqlar. Mevlananın iti ağlına baxın ki, tolerantlığı dinləməyə, şəfqəti gözlərə, sevgini danışmaya layiq görür. Bir insan tolerant olub dinləsə, şəfqətli olub baxsa, sevərək olub danışsa, mələk davranışlı bir insan olar (3):

***Listen with ears of tolerance. See through the eyes of compassion. Speak with the language of love.***

*Tolerant qulaqlar ilə dinləyin. Şəfqət gözləri ilə baxın. Sevgi dili ilə danışın.*

Susma olmadan sözlər öz anlamını itirir, hər kəsin uzaqlaşmaq istədiyi boş sözlərə - arxasında güc və güvənin olmadığı boş sözlərə dönür. Demək, susmayan və düşünməyən bir beyin anlamsız sözlər səsləndirər. Dinləmə olmadan danışma bir kimsəni toxtatmaz, bir kimsənin acısına dərman olmaz. Demək, danışanı toxtadan edən dinləməkdir. Məsafə (pis işlərdən aralanma) olmadan yaxınlıq sağalda bilməz (fayda verə bilməz). Susmaya, dinləməyə, təmiz ünsiyyətə üstünlük verən amerikan yazarı Henri Nouven demişkən (11):

***Somewhere we know that without silence words lose their meaning, that without listening speaking no longer heals, that without distance closeness can not cure.***

*Hardasa bilirik ki, susma olmadan sözlər öz anlamını itirər, dinləmə olmadan danışmaq məlhəm olmaz, məsafə olmadan yaxınlıq sağalda bilməz.*

Atalar sözləri xalqın yaşamından, uğurlarından, itkilərindən, inanclarından, dini baxışlarından, məişətindən qaynaqlanan sabit söz birləşmələridir. Onlar əsrlər boyunca xalqın dil süzgəcindən keçərək, ədəbi və danışıq dillərinin leksikonunda işləmək haqqı qazanıblar. Azərbaycan və ingilis dilləri atalar sözləri ilə zəngindir. Onların bir çoxu dinləmənin faydalarını sərgiləyən ifadələrdir. Müqayisə üçün, 3 atalar sözünü seçərək, hərfi (söz-söz) çevirməsini və mənalarını təqdim edirik (12):

**1. Keep your mouth shut and your ears open.**

Ağzını qapalı tut, qulaqlarını-açıq.

Az danışın, çox dinləyin.

**2. Give every man thy ear, but few thy voice.**

*Hər kəsə qulaq ver, amma az adama– səs ver.*

*Çox dinləyin, az danışın.*

**3. Be swift to hear, slow to speak.**

*Dinləməyə çevik ol, danışmağa-ləng ol.*

*Çox dinləyin, az danışın.*

İkinci sıradakı atalar sözündə iki frazeoloji feil var: birinci, “dinlə” anlamında “give ear” (“qulaq ver”), ikinci, “danış” mənasında “give voice” (“səs ver”).

**Məqalənin aktuallığı.**

Bəşər özünü tanıyandan indiyədək dinləmə və söz söyləmək aktual olub, aktualdır və hər zaman aktual qalacaqdır. İnsan bu platonik (ülvi) cütlüyün var olmasından öz varlığını davam etdirir,

gününə anlam və mənəvi zövq qatır. Əgər insan yaşamından sadalanan ikisi çıxarılsaydı, gözəlliklər oylağı olan dünya öz rövnəqini (mənəvi parıltısını) itirərdi, bəşərin qazandığı uğurların heç biri ortada olmazdı və dərin qənaətimizcə, bəşər çoxdan yox olardı. Demək, bəşərin ayaqda qalması üçün, sıxıntılar önündə duruş gətirib tərəqqi etməsi üçün hava, su, qida ilə yanaşı ona dinləmə və söz söyləmə bacarığı olduqca vacibdir.

Məqalənin aktuallığı odur ki, bir alim xanımın qələmində söz və dinləmə incələnir, çağdaş dövrümüz üçün, özəlliklə insan dəyərlərinin üzü aşağı yuvarlanmağa davam etdiyi indiki zamanda onların önəmi önə çəkilərək, düşünən, yaradan, var edən insan varlığının söz və dinləmə varlığından keçdiyi təkidlə vurğulanır.

Mövzunun digər aktuallığı odur ki, məqaləni yazan mövzunun özəlini təşkil edərək ona yön verən ingiliscə 13 sitatın, özünün Azərbaycan dilinə etdiyi dəqiq və peşəkar tərcümələrin, habelə müəllifin şəxsi açıqlamalarının işığında məqalə ərsəyə gəlib. Məqalənin fərqləndirici özəlliyi odur ki, orda yer alan sitatlar dünyanın elm və zəka mərkəzi sayılan ABŞ-dan olan müasir yazar, iş və sənət adamlarının qələmindən çıxan düşüncələrdir.

## Nəticə

Bu elmi məqalə 8 bəndli bir nəticə ilə bitir, o da budur ki:

1. İnsanın bir ağzı, iki qulağı və iki gözü var. Bu o deməkdir ki, insan 1 deməli, 4 dinləməlidir, başqa sözlə, insanın dediyi onun dinlədiyinin beşdə biri olamlıdır.
2. Dinləmək bir sənətdir, bir üstün bacarıqdır. Onun danılmaz önəmini əsasən yazarlar deyil, böyük biznes quran yazarlar yaxşı anlayır və işıqlandırırlar.
3. İnsanlar arası münasibətlərdə dinləmənin prioritet olmasından ən çox yazan, bu problemə ən çox diqqət yetirən iş adamları olan amerikan yazarlarıdır. Bu üzdən də ABŞ-dakı uğurlu biznesin dünyada tayı yoxdur.
4. Dinləmək enerji toplamaqdır, sayğı qazanmaqdır, uğur əldə etməkdir, seçilən bir fərdə dönməkdir.
5. Tanrı mesajlarını oxumaqla Onu dinləyən bir insan üstün insan cərgəsində yer alır.
6. İstər ingiliscə, istər azərbaycanca dinləmənin önəmini qabardan bir çox atalar sözləri var. Bu məqalənin toxunduğu hər bir atalar sözü bir publisistik məqalə mövzusudur.
7. Məqalə müəllifi fransızca və almanca bilən alimlərimizə səslənir ki, bu dillərdəki qaynaqlara dayanıb, insanlar arası münasibətlərdə dinləmənin önəmindən elmi məqalələr yazsınlar.
8. Məqalə ünsiyyət, psixologiya və biznes ilə maraqlanan şəxslər üçün daha keçərlidir.

## Ədəbiyyat

1. Thich, Nhat Hanh. (1992). Peace is every step. Hanoi, 134 p.
2. Iacocce, L., William, N. (1986). An autobiography of Lee Iacocce. New York: “Bantam”, 365 p.
3. https://www.goodreads.com / Quote by Karl Menninger, Rumi
4. https://www.goodreads.com / listening Quotes / Roy-Leslie Bennett
5. https://www.linkedin.com / Most of the / Bernard Baruch
6. https://www.everydaypower.com / 100+listening Quotes / Criss Jomi
7. Covey, S.R. (1989). The 7 Habits of highly effective people. USA: “Free Press”, 381 p.
8. Hardman, Emilia. (2012). Active listening 101. USA, 56 p.
9. Leal, B. (2017). 4 Essential keys to effective communication. USA: “Greate speace inderpendent publishing platform”, 131 p.
10. https://www.azquotes.com / Harvey Mackay Quote
11. https://www.quote.com / 200 Listening Quotes / Henri Nouwen
12. https://www.englishspeakingcourse.com / Expansion of an idea

Göndərilib: 01.08.2023 Qəbul edilib: 30.09.2023

DOI: https://doi.org/10.36719/2663-4619/95/25-31

**Rövşən Ramizoğlu**
Səlcuq Universiteti
filologiya üzrə fəlsəfə doktoru
rovshan@selcuk.edu.tr

# HÜQUQİ TƏRCÜMƏNİN NƏZƏRİ VƏ PRAKTİK ASPEKTLƏRİ

## Xülasə

Məqalə hüquqi tərcümənin özünəməxsus xüsusiyyətlərinin tədqiqinə həsr olunub. Son illər hüquqi tərcümənin aktual problemlərinin öyrənilməsinə həsr olunan tədqiqat işlərinin sayında ciddi artış nəzərə çarpır. Bu tədqiqatların demək olar ki, hamısında hüquq mətnlərinin tərcüməsi ilə məşğul olan tərcüməçinin hüquq sahəsi ilə də yaxından tanış olmasının vacibliyi vurğulanır. Çünki hüquq terminlərinin, klişelərinin uğurlu tərcüməsi üçün onların anlamlarını bilmək vacib şərtdir. Bundan başqa tərcüməçi ölkələrin hüquq sistemləri haqqında da məlumatlı olmalıdır. Bir başqa vacib şərt hüquqi tərcümədə emosional bitərəfliyin qorunması, doğru informasiya mənbələrinin seçilməsidir. Bununla yanaşı tərcüməçi hüquq mətnlərinin tərcümədə aparıcı üslub xüsusiyyətlərini də qorumağa çalışmalıdır.

Məqalədə yuxarıda qeyd olunan məsələlərin tədqiqi ilə bərabər hüquqi tərcümənin müxtəlif növlərinin geniş təhlili də öz əksini tapmışdır.

***Açar sözlər:*** *tərcümə növləri, hüquqi tərcümə, hüquq terminologiyası, hüquq mətni, sənəd tərcüməsi*

**Rovshan Ramizoghlu**
Selchuk University
PhD in Philology
rovshan@selcuk.edu.tr

# Theoretical and practical aspects of legal translation

## Abstract

The article is devoted to the study of the unique features of legal translation. In recent years, a significant increase in the number of research works dedicated to the study of the actual problems of legal translation has been noticed. Almost all of these studies emphasize the importance of the translator who is engaged in the translation of legal texts to be familiar with the legal field.

Because for the successful translation of legal terms and clichés, it is important to know their meaning. In addition, the translator must be knowledgeable about the legal systems of the countries. Another important condition in legal translation is maintaining emotional neutrality and choosing the right sources of information. At the same time, the translator should try to preserve the leading stylistic features of the legal texts in the translation.

Along with the study of the above-mentioned issues, the article also includes a broad analysis of different types of legal translation.

***Keywords:*** *types of translation, legal translation, legal terminology, legal text, document translation*

## Giriş

Müasir dövrdə tərcümənin bir çox növünün tədqiq olunması xüsusi aktuallıq qazanmışdır. Məsələn, texnologiyanın inkişafı ilə bağlı olaraq texniki tərcümənin öyrənilməsinə olan maraq xeyli dərəcədə artmışdır. Səhiyyə sahəsinin inkişafı tibbi tərcümə sahəsində yeni terminlərin meydana çıxmasına səbəb olmuşdur. Beynəlxalq münasibətlərin, dövlətlər arasında ikitərəfli və çoxtərəfli əlaqələrin intensivləşməsi diplomatik tərcümənin inkişafına təkan vermişdir. İnkişaf hüquqi tərcümə

sahəsindən də yan keçməmişdir. Qloballaşma prosesi müxtəlif ölkələrin hüquq və ədliyyə sistemlərinin təmərküzləşməsinə gətirib çıxarmışdır. Ölkələr beynəlxalq hüquqi aktlara, qanunlara qoşulduqca beynəlmiləl hüquq terminologiyası formalaşmışdır. Bu terminologiya sayəsində çox işlənən bir çox hüquq termininin mənası artıq hamı tərəfindən anlaşılır. Məsələn, bu gün "status-kvo", "de-fakto", "de-yure" kimi hüquq terminlərinin mənasını sadəcə bu sahənin mütəxəssisləri deyil, demək olar ki, hər kəs anlayır. Ümumi hüquq terminləri bazasının formalaşması bu sahə tərcüməçilərinin işini xeyli asanlaşdırmışdır. Amma təbii ki, hər bir ölkənin hüquq sistemi üçün xarakterik olan terminlər də mövcuddur. Bu səbəbdən tərcüməçi həm orijinalın, həm də tərcümə dilinin hüqiq terminologiyasına yaxından bələd olmalıdır. Digər tərəfdən, hüquq sahəsinə aid olan mətnlərdə sadəcə terminlərə deyil, hüquqi klişelərə-müəyyən hüquqi məna daşıyan ifadələrə də rast gəlinir. Bu cür ifadələrin tərcüməsi daha böyük çətinliklər yaradır. Onları tərcümə edə bilmək üçün tərcüməçi hüquq sistemi haqqında kifayət qədər dərin biliklərə malik olmalıdır. Üstəlik, hüquq sistemi özü də bir çox sahələrə ayrılır: vergi hüququ, mülki hüquq, konstitusiya hüququ, beynəlxalq hüquq, inzibati hüquq, ticarət hüququ, cinayət hüququ və s. Bu hüquq sahələrinə aid mətnlərin hər birinin bəzən bir-birindən kəskin fərqlənən spesifik terminologiyası, klişeləri olur. Hüquqşünasların bu sahələrdən sadəcə biri üzrə ixtisaslaşması halları mövcud olduğu kimi, tərcüməçilərin də bu sahələrdən yalnız birinə aid materialların tərcüməsinə yönəlməsi hallarına rast gəlmək mümkündür. Çünki hüquqi tərcümə sadəcə peşəkarlıq deyil, həm də böyük məsuliyyət tələb edən tərcümə növüdür. Hüquqi sənədlərdə tərcümə xətası maddi və mənəvi zərərin dəyməsinə, bununla bağlı məhkəmə işlərinin açılmasına belə gətirib çıxara bilər. Buna görə də bu növ tərcümə ilə məşğul olan tərcüməçilərdən çox vaxt sadəcə iki dili bilmək yox, həm də hüquq təhsilinin olması tələb edilir.

**1. Hüquqi tərcümənin özünəməxsus xüsusiyyətləri.**

Hüquqi tərcümənin nəzəri problemlərinin öyrənilməsinə son illər çox sayda tədqiqat işi həsr olunmuşdur. Bu tədqiqatlarda hüquqi tərcüməyə tərif verilməsi, onun növlərinin müəyyənləşdirilməsi, metodoloji problemlərinin ortaya çıxarılması kimi fərqli məsələlər nəzərdən keçirilmişdir. Hüquq terminologiyasının öyrənilməsinə də kifayət qədər böyük diqqət ayrıldığını müşahidə etmək mümkündür. Əslində, istənilən sahə tərcüməsinin (tibb, idman, diplomatiya, tarix, iqtisadiyyat və s.) tədqiqinə hər zaman onun terminoloji bazasının öyrənilməsindən başlanılır. Bu prinsip artıq müasir tərcüməşünaslıqda bir tendensiya halını almışdır. Amma konkret hüquqi tərcümə sahəsində bütün problemlərin həllinin açarının hüquq terminologiyasında olduğunu söyləmək doğru deyil. Müasir rus tədqiqatçılarından Y.D.Malyonova və L.A.Matveyeva 2014-cü ildə nəşr etdirdikləri "Hüquq mətnlərinin tərcüməsinin praktiki əsasları" adlı kitablarında bu mövzu ilə bağlı aşağıdakıları yazırlar: "Hüquqi tərcümənin əsas problemi, adətən təsəvvür edildiyi kimi, terminologiya problemi deyil. İstənilən fəaliyyət sahəsində terminlər var və hər bir tərcüməçi gec-tez terminoloji çətinliklərlə qarşılaşır. Əsas problem hüquq sistemlərindəki fərqlilikdir" (Malyonova, Matveyeva, 2014: 6). Orijinal hüquq mətni bir ökənin hüquq sisteminə uyğun şəkildə yazılmış olur və bu xüsusiyyət onun içindəki hüquqi formullarda öz əksini tapır. Tərcümə mətnini isə başqa bir ölkənin öz səciyyəvi hüquqi formulları olan fərqli hüquq sisteminə uyğunlaşdırmaq lazımdır. Əslində, hüquqi tərcümənin ən çətin tərəfi də məhz budur. Digər bir rus tədqiqatçı A.A.Atabekova da 2015-ci ildə nəşr etdirdiyi "Hüquqi tərcümə fənlərarası kontekstdə" adlı monoqrafiyasında hüquqi tərcümənin keyfiyyəti üçün milli hüquq sistemlərinin özünəməxsusluqlarına bələd olmanın vacibliyini belə şərh edir: "Hüquqi tərcümə sahəsində müxtəlif dillərlə işləyən bir çox mütəxəssis vurğulayır ki, hüquqi tərcümənin özünəməxsusluğu milli hüquq sistemlərinin spesifikasına və etnomədəni xüsusiyyətlərinə görə xüsusi anlayışların interpretasiyası və onların şərh edilməsi zərurəti ilə şərtlənir" (Atabekova, 2015: 33-34). Hüquqi tərcümə zamanı bir hüquq sistemindən digərinə bir növ "keçid" baş verir. Bu keçidi rus tədqiqatçı K.M.Levitan özünün "Hüquqi tərcümə: nəzəri və praktik əsasları" kitabında belə izah edir: "Hüquq mətnlərinin bir dildən başqa bir dilə tərcüməsi təkcə bir dildən digərinə keçidi nəzərdə tutmur, eyni zamanda özündə hüquqşünas-tərcüməçinin şüurunda öz ölkəsinin hüquqi reallığının konseptual mənzərəsi kimi təqdim olunan bir hüquq sistemindən başqa bir hüquq dünyasına keçidi də ehtiva edir" (Levitan, 2015: 28). Bəzi terminlərin, hüquq klişelərinin hər iki dildə geniş istifadə edilən

ekvivalentləri mövcud olur. Bu hal iki hüquq sistemi arasındakı keçidi asanlaşdırır. Amma bəzən bu cür ekvivalentlərə tərcümə dilində rast gəlinmir. Belə olan halda tərcüməçi mənanı düzgün çatdırmaq üçün tərcümə mətnini orijinal mətnə uyğunlaşdırır: mənanı təhrif etmədən orijinalın kəlimələrini tərcümə mətninin oxucusunun anladığı kəlimələr ilə dəyişdirir, yəni kəlimənin tərcümə dilindəki yaxın mənaya sahib qarşılığını verir. Çox az halda isə orijinaldakı hüquq terminləri, klişeləri tərcümə mətninə olduğu kimi köçürülür, yəni hərfi tərcümədən istifadə olunur. Bu halda tərcüməçi tərcümə dilində mövcud olmayan bu terminlərin, klişelərin izahını haşiyə kimi mətnin və ya səhifənin sonunda açıqlayır. Nadirən isə tərcüməçi bu terminlərin və klişelərin tərcümə dilindəki qarşılıqlarını, ekvivalentlərini özü yaratmağa çalışır. Bununla bağlı tədqiqatçı T.Məmmədova aşağıdakıları yazır: "tərcümə prosesində elə söz qruplarına rast gəlinir ki, onların hədəf dildə ekvivalenti olmur və bu tərcümə prosesində böyük problemlər yaradır. Bu söz qrupları ekvivalentsiz leksika adlanır. Ekvivalentsiz leksika tərcüməçidən böyük ustalıq tələb edir. Mütərcim bu sözləri tərcümə etmək üçün termin yaradıcılığına üz tutaraq müasir hüquq terminologiyasında geniş yer almış ekvivalent sinonimlər, neologizmlər yaradır. Çünki xüsusi mətnlərdə işlədilən bu leksik vahidlər-terminlər mətndə verilmiş informasiyanı təşkil edir və istiqamətləndirir" (Məmmədova, 2020: 37). Qeyd etmək lazımdır ki, sonuncu hal, yəni tərcüməçinin termin və ya söz "yaradıcılığı" ilə məşğul olması bir çox mütəxəssis tərəfindən müsbət qarşılanmır. Onlar hesab edirlər ki, hətta ekvivalent sinonimlər, neologizmlər olsalar belə, yeni terminlərin yaradılması işi ilə tərcüməçilər yox, konkret sahənin mütəxəssisləri (bizim halda hüquqşünaslar) məşğul olmalıdırlar.

Təbii ki, hüquq mətnlərinin tərcüməsini çətinləşdirən amillər sadəcə milli hüquq sistemləri arasındakı fərqlər və ya tərcümə dilində orijinaldakı hüquq terminlərinin, klişelərinin doğru ekvivalentlərinin tapılması, yaradılması deyil. İ.S.Alekseyeva qeyd edir ki, "hüquqi mətn həm elmi mətn, həm də təlimat mətni ilə oxşarlıqlara malikdir, çünki o, həm idrak, həm də göstəriş funksiyalarını yerinə yetirir" (Alekseyeva, 2001: 216). Orijinalın yerinə yetirdiyi bu funksiyalar tərcümə mətni üçün də səciyyəvi olmalıdır. Amma hüquqi tərcümə qarşısında qoyulan şərtlər sadəcə orijinal mətnin funksiyalarının tərcümə mətninə ötürülməsi ilə məhdudlaşmır. Mütəxəssislər bu növ tərcümənin bir çox şərtlərə cavab verməli olduğunu yazırlar. Məsələn, bir neçə müəllifin kollektiv əsəri olan "Hüquqi tərcümə" kitabında rus tədqiqatçı P.V.Rıbin bu şərtləri belə qruplaşdırır: "Hüquq sənədinin tərcüməsi bu cür olmalıdır:

1) orijinalda olan hüquqi məlumatları tam, dəqiq və aydın şəkildə çatdırmalıdır;
2) hüquq sənədinin aparıcı üslub xüsusiyyətlərini (imperativlik, dəqiqlik, obyektivlik, standartlaşdırma) qorumalıdır;
3) mənbə dilin konseptual hüquq sistemini əks etdirməlidir;
4) tərcüməni oxuyanlar üçün anlaşılan olmalı və sifarişçi tərəfindən tərcüməçi qarşısında qoyulan praqmatik tərcümə vəzifələrini həll etməlidir;
5) tərcümə dilinin rəsmi işgüzar nitqdə istifadə olunan normalarına əməl etməlidir" (Ribin, 2018: 14)

Hüquqi tərcümə üçün irəli sürülən şərtlər sadəcə yuxarıda qeyd olunanlar deyil. Bu şərtlərin sayını daha da artırmaq olar. Məsələn, hüquqi tərcümədə emosional bitərəfliyin qorunması da vacib şərtlərdən biridir. Əslində, bu şərt sahə tərcümələri və ya texniki tərcümə qarşısında da qoyulur. Bədii tərcümədə tez-tez rast gəlinən emosionallıq hüquq mətnlərində sıfır səviyyəsində olmalıdır. Hətta bu hüquq mətni, məsələn, ölüm hökmü ilə bağlı bir sənədin mətni olsa belə, o çox bitərəf bir dillə yazılmalı və elə o cür bitərəf bir dillə də tərcümə edilməlidir. Çünki hüquq mətninin məqsədi faktları qısa, lakonik şəkildə, lazımsız haşiyələrə çıxmadan təqdim etməkdir. Emosional bitərəflik diqqətin faktın mahiyyəti üzərində cəmlənməsinə yardımçı olur. Bununla bağlı V.B.İsakov "Hüquq dili" adlı məqaləsində qeyd edir ki, "hüquq dili, məsələn, lüğətinin "emosional yüklənməsi" ilə səciyyələnən, başdan müəllifin mövqeyini ortaya qoyan jurnalistika dilindən fərqlənir" (Isakov, 2000: 65).

Hüquqi tərcümə ilə məşğul olan tərcüməçi üçün vacib şərtlərdən biri də informasiya mənbələri ilə doğru şəkildə işləyə bilmək bacarığına sahib olmaqdır. Bu sahə tərcüməçiləri adətən informasiya mənbəyi kimi hüquq sorğu kitablarından faydalanırlar. Bəzən ikidilli lüğətlər də informasiya

mənbəyi rolunu oynayır. Amma tərcümədə ən çox səhvlərin meydana çıxmasına da məhz bu səbəb olur. Çünki bu növ lüğətlərdə yer alan terminlərin hansı hüquq sahəsinə aid olduğu qeyd edilmir. Ona görə də bu lüğətlərdən yanlış istifadə, məsələn, cinayət hüququ haqqında bir mətndə ticarət hüququ ilə bağlı bir terminin və ya konstitusiya hüququna dair bir sənəddə inzibati hüquqa dair bir ifadənin işlənməsi kimi xətaların ortaya çıxması ilə nəticələnə bilir.

Son illər hüquqi tərcümə ilə bağlı aparılan tədqiqat işlərinin ən çatışmayan cəhəti onlarda bu növ tərcümənin texniki tərcümə ilə müqayisə olunması, əsasən hüquq terminologiyasının, ən yaxşı halda hüquq sistemlərinin təhlil edilməsidir. Amma hüquq mətninin tərcüməsini, məsələn, hər hansısa bir texniki cihazın, alətin istismar təlimatının tərcüməsi ilə eyniləşdirmək düzgün deyil. D.N.Şlepnev "Hüquqi tərcümə kursu" adlı məqaləsində hüquqi tərcüməni mədəniyyətlərarası kommunikasiyanın ifadəsi kimi dəyərləndirərək yazır: "Hüquqi tərcümə, əslində, mədəniyyətlərarası kommunikasiyanın spesifik (və ya hətta ən bariz) ifadəsidir. Bu, hüququn milli mədəniyyətdə dərin kök salması, milli mədəniyyətin tərkib hissəsi olması ilə əlaqədardır. Nəticədə, hətta eyni hüquq ailəsinə mənsub olan ölkələrin hüquq sistemlərində belə ciddi fərqlər müşahidə edilə bilər" (Shlepnev, 2017: 77).

Tədqiqatçı İ.İ.Kovalevskaya da "Hüquqi tərcümə mədəniyyətlərarası kommunikasıya növü kimi" başlıqlı tezisində hüqiqi tərcümənin dillərarası kommunikasiya aktından daha çox mədəniyyətlərarası kommunikasıya aktı olduğunu qeyd edir. O, hüquqi tərcümənin öyrənilməsinin nəzəri və metodoloji əsasını müxtəlif elmi istiqamətlərin kəsişməsində inkişaf edən yanaşmaların təşkil etdiyini vurğulayır. Tədqiqatçı bu yanaşmalar arasında linqvokulturoloji, linqvokonseptoloji, funksional-üslubi, diskursiv, hüquqi-linqvistik yanaşmaların adını çəkərək yazır: "Müəyyən edilmiş yanaşmalara uyğun olaraq, hüquqi tərcümə dillərarası kommunikasiya aktı kimi deyil, daha çox mədəniyyətlərarası kommunikasiya aktı kimi müəyyən edilir, çünki "müxtəlif hüquq sistemləri və hüquq mədəniyyətləri tərcümə təmasında olur". Bu baxımdan, hüquq sahəsinə aid mətnlərin tərcüməsi faktiki dillərarası informasiya mübadiləsi kimi dəyərləndirilərək məhdudlaşdırılmır, mədəniyyətlərarası kommunikasiya prosesi kimi qəbul edilir" (Kovalevskaya, 2020: 512).

Təbii ki, hüquqi tərcümənin mədəniyyətlərarası kommunikasiya vasitəsi kimi tədqiq olunması onun yeni yönlərini, səciyyəvi xüsusiyyətlərini ortaya çıxarmağa imkan verir. Amma hüquqi tərcüməyə ümumi yanaşma ilə bərabər onun ayrı-ayrı növlərinin öyrənilməsi də böyük əhəmiyyət daşıyır. Bu növlər arasında kifayət qədər bənzərliklər olsa da, bəzən ciddi fərqliliklər də müşahidə etmək mümkündür. Araşdırma məqaləmizin sonrakı bölümündə hüquqi tərcümənin müxtəlif növlərini təhlil və tədqiq etməyə çalışacağıq.

**2. Hüquqi tərcümənin növləri.**

Hüququ tərcümənin növlərini təhlil etməzdən əvvəl, ümumiyyətlə, hüquq mətni və ya hüquq sənədi anlayışına aydınlıq gətirmək lazımdır. Çünki istənilən növ hüquqi tərcümənin materialını məhz hüquq sənədləri təşkil edir. Fikrimizcə, hüquq sənədi anlayışına ən yaxşı tərifi L.A.Morozova özünün "Dövlət və hüquq nəzəriyyəsi" kitabında vermişdir: "Adətən hüquq sənədlərinin aşağıdakı xüsusiyyətlərini qeyd edirlər:

1) onlar özlərində hüquqi əhəmiyyət kəsb edən məlumatları ehtiva edir; bununla yanaşı məzmun sənədin xarakterinə uyğun olur;

2) onlar rəsmi səciyyə daşımaları ilə xarakterizə edilir: onlar bu sənədləri vermək və ya qəbul etmək səlahiyyətinə malik olan orqanlar və ya şəxslər tərəfindən göndərilir;

3) onlar rekvizit adlanan xarici tərtibat formasına və ya hüquq sənədinin subyekti və adresatı haqqında məlumatlara malik olurlar. Qeyd edilən rekvizitlər onlara hüquqi qüvvə qazandırır;

4) onlar hüquqi tənzimləmənin bütün mərhələləri – qanun yaradıcılığı, qanun icrası və s. bağlı ola bilirlər" (Morozova, 2010: 379).

Hüquq sənədi haqqında digər mütəxəssislərin fikirləri L.A.Morozovanın fikirləri ilə bənzər olsa da, onların hüquqi tərcümə növləri haqqında yazdıqları bəzən bir-birindən ciddi surətdə fərqlənir. Bu səbəbdən mütəxəssislər bu günə qədər hüquqi tərcümənin hamı tərəfindən qəbul edilən növlərinin müəyyənləşdirilməsi ilə bağlı ümumi fikrə gələ bilməmişlər. Mütəxəssislərin bəziləri bu növlərin bir neçəsini bir kateqoriyaya aid edərək daha az şaxələnmə tərəfdarı kimi çıxış edirlər.

Digərləri isə hüquq sənədi sayı qədər hüquqi tərcümə növü müəyyənləşdirməyə çalışırlar ki, bu da çox sayda hüquqi tərcümə növünün meydana gəlməsi deməkdir. Fikrimizcə, hər iki yanaşma yanlışdır və bu sahədə sistemləşmə aparmağa ehtiyac duyulur.

Bununla belə müxtəlif mənbələrdən əldə edilən məlumatları ümumiləşdirərək hüquqi tərcümənin aşağıdakı əsas 7 növünün olduğunu söyləmək mümkündür:

1. müxtəlif ölkələrin dövlət orqanlarının qanunvericilik və normativ hüquqi aktlarının (qanunlar, protokollar, əsasnamələr, fərmanlar, qaydalar və s.) tərcüməsi. Bu sənədlər beynəlxalq və ya yerli aktlar ola bilər. Onların tərcüməsi çətinlik doğurmur. Bunun əsas səbəbi mətnlərin quruluşunun sadə olması və məzmunda çoxlu sayda təkrara yer verilməsidir.

2. lokal normativ aktların (qanunların, qaydaların və s.) tərcüməsi. Bu tərcümə də müəyyən sənəd şablonlarının mövcud olması səbəbi ilə asan hüquqi tərcümə növlərindən hesab olunur.

3. müqavilələrin, kontraktların və razılaşmaların, o cümlədən alqı-satqı, malların tədarükü və binaların icarəsi müqavilələrinin; əmək müqavilələrinin; lisenziya razılaşmalarının tərcüməsi. Çox vaxt bu növ tərcümə sifarişləri təcili xarakter daşıyır, məzmunlarında çoxlu sayda qeyri-dəqiqliklər olur və sənədin mətni qarışıq üslubda yazılmış ola bilir.

4. məhkəmə sənədlərinin (bəyanatların, vəsatətlərin, məhkəmə qərarlarının, göstərişlərin, qətnamələrin və s.) tərcüməsi. Bu, tərcüməçidən böyük məsuliyyət tələb edən hüquqi tərcümə növüdür. Çünki ən kiçik bir tərcümə xətası aradan qaldırılması çətin olan ciddi problemlər meydana çıxara bilər.

5. təsis və ya nizamnamə sənədlərinin (nizamnamələr, təsis müqavilələri, qərarlar, protokollar, qeydiyyat və uçotaalma haqqında şəhadətnamələr və s.) tərcüməsi. Bu, ən az problemli hüquqi tərcümə növü hesab edilir. Çünki bu növə aid edilən hüquq sənədlərinin kiçik həcmi və tipik tərtibat formaları olur.

6. müşayiətedici (qoşma) sənədlərin (etibarnamələr, şəhadətnamələr, sertifikatlar, lisenziyalar, icazələr, vəkalətnamələr və s.) tərcüməsi. Bu növ sənədlərin məzmunları əsasən eyni olduğu üçün tərcüməsi problem yaratmır. Amma müəyyən hallarda məzmun fərqlərinin mövcud olması da mümkündür.

7. “şablon” sənədlərin (blankların, vəsiqələrin və s.) tərcüməsi. Dəqiq məlumatlara və rəqəmlərə (soyadlar, tarixlər və s.) diqqət yetirməyi tələb edir.

Yuxarıdakı hüquqi tərcümə növlərinin materialı rolunda çıxış edən çoxsaylı hüquq sənədlərinin hər birinin spesifikası tərcümə mətnində qorunub saxlanılmalıdır. Bununla bağlı A.S. Kinderknext aşağıdakıları yazır: “Hüquq mətni janrında bir çox alt janr mövcuddur: müqavilələr, nizamnamələr, qanunlar, sərəncamlar, məhkəmə qərarları, ifadələr, ekspertizalar, iddialar, bəyanatlar, inzibati mətnlər (idarə yazışmaları), tədris ədəbiyyatı və s. Bu mətn kateqoriyalarının hər birinin öz xüsusiyyətləri var və bu xüsusiyyətlər mümkün qədər tərcümədə qorunmalıdır” (Kinderknekht, 2015: 125).

Əslində, yuxarıda qeyd olunan hüquqi tərcümə növləri siyahısı yekun siyahı kimi dəyərləndirilməməlidir, onu uzatmaq və ya qısaltmaq da mümkündür. Amma istənilən halda hər növ hüquqi tərcümənin özündə müəyyən risk ehtiva etdiyini də vurğulamaq gərəkdir. Bu növ tərcümələrdə hər hansısa qeyri-dəqiqlik və ya səhv ağır nəticələr doğura, məhkəmə işlərinin açılması, ciddi cəzaların təyin olunması kimi hüquqi prosedurların başladılmasına təkan verə bilər. Buna görə də hüquq mətnlərinin tərcüməsi ilə bu sahədə təcrübəsi olan tərcüməçilərin məşğul olması daha məqsədəuyğundur.

Hüquqi tərcümə növlərinin əsas xüsusiyyətləri hüquq mətninin növündən, onun daşıdığı funksiyalardan və ünvanlandığı auditoriyadan asılıdır. Bu növ tərcümənin xarakterik xüsusiyyətlərini tədqiq edən M.M.Muşinina yazır ki, hüquqi tərcümədə dəqiqlik, anlaşılma və səlis üslub kimi xüsusiyyətlərin çox vaxt bir-birini istisna etməsi mümkündür: “Geniş oxucu kütləsini müəyyən hüquqi məsələlərlə tanış etmək məqsədi daşıyan hüquqi müzakirələrin tərcüməsi zamanı anlaşılma və üslub məlumatın çatdırılmasında dəqiqlikdən daha önəmli ola bilər... Başqa ölkədə yerinə yetiriləcək hökmün tərcüməsi zamanı isə dəqiqlik ən vacib tələbdir” (Mushinina, 2004: 29).

Bundan başqa müəyyən hüquq sənədləri var ki, onların hazırlanmasında tərcüməçi son instansiya deyil. Bu cür sənədlər tərcümədən sonra notarial təsdiqə göndərilir. Təbii ki, bu, qanunverici və hüquqi, lokal normativ aktlar və s. sənədlərə aid deyil. Amma şəhadətnamə, etibarnamə, vəkalətnamə kimi sənədlərin çox vaxt tərcümədən sonra hər hansısa bir notarial kontorda təsdiqinə də ehtiyac duyulur. Hətta bəzən belə təsdiq bir neçə mərhələli olur və notarial kontordan sonra apostil edilməsi üçün hansısa dövlət qurumuna da göndərilir. Sənədləri notarial təsdiq və apostil üçün uyğun formada tərtib etmək, bununla bağlı sifarişçiyə müvafiq izahatlar vermək də tərcüməçinin vəzifələrinə aiddir. Çünki notarial kontorun, apostili edən dövlət qurumunun fəaliyyəti tərcüməçinin və ya tərcümə agentliklərinin nəzarətindən kənarda baş verən bir fəaliyyət olsa da, nəticəyə görə onlar da məsuliyyət daşıyırlar. Bu səbəbdən, hüquqi tərcümə ilə məşğul olan hər bir tərcüməçi əlaqəli hüquqi xidmətlərin mahiyyətini də yaxşı anlamalıdır.

Hüquq sənədlərinin tərcümələrinin tərtibatları da bir-birindən fərqlənə bilər. Müəyyən hallarda bu cür sənədlərin tərcüməsi zamanı onları iki sütun şəklində tərtib etmək lazım gəlir. Bu orijinal mətn ilə tərcümə mətninin müqayisəsinin aparıla bilməsi üçün edilir. Belə tərtibat sənədlə işi asanlaşdırdığı üçün tərcümənin göndəriləcəyi rəsmi orqanlar tərəfindən tələb oluna bilər. Bəzən bütün bu tələbləri uyğun bir şəkildə qarşılaya bilmək üçün hüquq sənədlərinin tərcüməsinin yoxlanılması bu sahədə ixtisaslaşmış digər şəxsə tapşırılır. Bu yolla məna səhvlərini, texniki yanlışlıqları, tərtibat xətalarını daha tez müəyyənləşdirmək və aradan qaldırmaq mümkün olur.

Yuxarıda yazılanları təhlil edib belə bir qənaətə gəlmək olar ki, hüququ tərcümə növündən asılı olaraq tərcüməçidən sadəcə tərcüməçilik deyil, digər bacarıqlar da tələb edilir. Bu tələbləri aşağıdakı kimi ümumiləşdirmək mümkündür:

1. Terminlər qlossarisinin və xüsusi adlarla təşkilati-hüquqi formaların tərcümədə verilməsi üsulunun əlaqələndirilməsi;
2. Tərcümənin hər iki ölkənin – həm orijinalın, həm də tərcümənin dilinin mənsub olduğu ölkələrin hüquq sistemi ilə tanış olan mütəxəssislər tərəfindən yerinə yetirilməsi;
3. Tərcümənin emosionallıqdan uzaq bitərəf dillə həyata keçirilməsi;
4. Məhkəmə qərarları kimi hüquqi sənədlərin tərcüməsində dəqiqliyə riayət edilməsi;
5. Zərurət duyulduqda tərcümə və orijinalın iki sütunda yanaşı verilməsi;
6. Hüquq sənədinin tərcüməsinin müvafiq tərtibatı; tərcümədən sonrakı mərhələlərə hazırlanması;
7. Tərcümə mətninin hüquq sənədlərinin tərcüməsi üzrə ixtisaslaşmış ikinci tərcüməçi tərəfindən yoxlanılması.

Bu qeyd olunanlar uğurlu hüquqi tərcümənin meydana çıxmasında əsas rol oynayan və yerinə yetirilməsi önəmli olan ən vacib şərtlərdir.

## Nəticə

Hüquqi tərcümə öz spesifik xüsusiyyətlərinə görə digər tərcümə növlərindən fərqlənir. Məqalədə bu xüsusiyyətlər hüquqi tərcümənin nəzəri və praktik aspektlərinin tədqiqi kontekstində nəzərdən keçirilmişdir. Tərcümə mətnində dəqiqliyin önəmi, emosionallığa yer verilməməsinin, tərcüməçinin hüquq sistemlərinə yaxından bələd olmasının vacibliyi bu spesifik xüsusiyyətlərin sadəcə bir neçəsidir. V.A.Verniqorovanın aşağıdakı fikirlərini hüquqi tərcümənin ən ümumiləşdirilmiş tərifi, onun mahiyyətini uğurlu şəkildə açıqlayan fikirlər hesab etmək olar: "Hüquqi tərcümə bir proses kimi qanunla şərtlənir. Hüquq mətnlərinin tərcüməçisi müxtəlif situativ, verbal, sosial və linqvistik amilləri və daxilində çalışmalı olduğu dil mühitinin xüsusiyyətlərini nəzərə almalıdır, əks halda o, səhvlərdən qaça bilməyəcək" (Vernigorova, 2011: 40).

## Ədəbiyyat

1. Malyonova, Y.D., Matveyeva, L.A. (2014). Osnovi praktiki yuridicheskikh tekstov: uchebno-metodicheskoe posobie. Omsk: Izd-vo Om. gos. un-ta, 108 s.
2. Atabekova, A.A. (2015). Yuridicheskiy perevod v mezhdistsiplinarnom kontekste: monografiya. Moskva: YUNITI-DANA, 131 s.

3. Levitan, K.M. (2015). Yuridicheskiy perevod: osnovi teoryy i praktiki: uchebnoe posobie. Moskva: Prospekt; Yekaterinburg: Izdatelskiy dom “Uralskaya Gosudarstvennaya Yuridicheskaya Akademiya”, 352 s.
4. Məmmədova, T. (2020). Hüquqi mətnlərin tərcüməsində terminoloji ekvivalentlik problemi. Semiotik yanaşma Dil və ədəbiyyat. X cild, № 2, s.34-39.
5. Alekseyeva, I.S. (2001). Professionalniy trening perevodchika: ucheb. posobie. SPb.: Izdatelstvo «SOYUZ», 288 s.
6. Ribin, P.V. (2018). Yuridicheskiy perevod: uchebnoe posobie po perevodu s angliyskogo yazika na russkiy. Moskva: Prospekt, 536 s.
7. Isakov, V.B. (2000). Yazik prava Yurislingvistika-2: Russkiy yazik v ego estestvennom i yuridicheskom bityy. Barnaul: Izd-vo Alt. un-ta, s.64-80.
8. Shlepnev, D.N. (2017). Kurs yuridicheskogo perevoda Metodicheskie osnovi podgotovki perevodchikov: obobshenie opita: Monografiya Pod obsh. red. V.V.Sdobnikova. N.Novqorod: NQLU, s.59-110.
9. Kovalevskaya, I.I. (2020). Yuridicheskiy perevod kak raznovidnost mezhkulturnoy kommunikatsyy Ekonomicheskiy rost Respubliki Belarus: globalizatsiya, innovatsionnost, ustoychivost: materiali XIII Mezhdunarodnoy nauchno-prakticheskkoy konferentsyy, Minsk, 14 maya 2020 g. M-vo obrazovaniya Resp. Belarus, Belorus. qos. ekon. un-t ; [redkol.: V.Y.Shutilin (otv. red.) i dr.]. Minsk: BGEU, s.512-513.
10. Morozova, L.A. (2010). Teoriya gosudarstva i prava. Moskva: Eksmo, 510 s.
11. Kinderknekht, A.S. (2015). Osobennosti perevoda yuridicheskikh tekstov Uchyonie zapiski Orlovskogo Gosudarstvennogo Universiteta. № 5 (68), s.123-127.
12. Mushinina, M.M. (2004). O pravavoy lingvistike v Germanyy i Avstryy Yurislingvistika: Yuridicheskie aspekti yazika i lingvisticheskie aspekti prava. Barnaul: Izd-vo Alt. un-ta, s.19-32.
13. Vernigorova, V.A. (2011). Yuridicheskiy perevod: nauka ili iskusstvo? Nauchniy obozrevatel, № 11, s.37-43.

Göndərilib: 17.08.2023 Qəbul edilib: 10.09.2023

DOI: https://doi.org/10.36719/2663-4619/95/32-36

**Mələkxanım Rəhimova**
Bakı Dövlət Universiteti
doktorant
UOT: 342, 727
melek.rahimovafff@gmail.com

# HEYDƏR ƏLİYEV ÖLKƏDƏ SOSİAL SİYASƏTİN YARADICISI KİMİ

**Xülasə**

Azərbaycan Respublikası qanunvericilik sisteminin əsasını təşkil edən Konstitusiyada dövlətin ali məqsədi kimi vətəndaşların layiqli həyat səviyyəsinin təmin olunması qeyd edilmişdir. Müasir dövrdə bu məqsədlə ölkədə həyata keçirilən sosial yönümlü prossesin əsası məhz Ulu Öndər Heydər Əliyev tərəfindən qoyulmuşdur. Məqalədə əhalinin həssas təbəqəsinin sosial müdafiəsinin təmin edilməsi məqsədi ilə Heydər Əliyevin hakimiyyəti illərində qəbul olunmuş milli normativ-hüquqi bazanın formalaşdırılması məsələləri araşdırılmış, islahatların həyata keçirilməsi, xarici dövlətlərlə münasibətlərin qurulması, ölkədə sosial siyasətin tətbiq olunması ətraflı şərh olunmuşdur.

***Açar sözlər:*** *sosial hüquqlar, ümummilli lider, sosial siyasət, sosial təminat, sosial müdafiə, normativ-hüquqi akt, layiqli həyat hüququ, referendum, sosial yönümlü proqram*

**Malakkhanim Rahimova**
Baku State University
PhD student
UOT: 342, 727
melek.rahimovafff@gmail.com

## Heydar Aliyev as the creator of social policy in the country

**Abstract**

In the Constitution, which forms the basis of the legislative system of the Republic of Azerbaijan, the highest goal of the state is to ensure a decent standard of living for citizens. To this end, the foundation of the socially oriented process carried out in the country in modern times was laid by the Great Leader Heydar Aliyev. In the article, in order to ensure the social protection of the vulnerable population, the issues of the formation of the national legal framework adopted during the years of Heydar Aliyev's rule, the implementation of reforms, the establishment of relations with foreign countries, and the implementation of social policy in the country were explained in detail.

***Keywords:*** *social rights, nationwide leader, social policy, social security, social protection, legal act, right to decent life, referendum, socially oriented program*

## Giriş

Vətəndaş cəmiyyəti və demokratik plüralizm sosial hüquqlar, onların qanunvericilikdə təsbiti və realizəsi ilə şərtlənir. Sosial hüquqlar cəmiyyət və dövlət tərəfindən qəbul edilən və normativ hüquqi aktlarda təsbit edilən hər bir insanın normal fizioloji, maddi və mənəvi mövcudiyyəti və inkişafı üçün layiqli sosial həyat və ictimai əhəmiyyətli fəaliyyəti üçün zəruri olan imkan, maraq və müəyyən xüsusiyyətini müdafiə və təmin edən hüquqlar kompleksidir. Sosial hüquqlar, əsasən, cəmiyyətdə sosial gərginliyin aradan qaldırılması məqsədilə əhalinin sosial müdafiəsinin həyata keçirilməsinə istiqamətlənir (Əliyev, 2019: 117-118). Sosial hüquqları təmin etməyin iki əsas yönü vardır: ideoloji və iqtisadi (2). Demokratik-hüquqi dövlətdə sosial-iqtisadi və mədəni hüquqlar insanın əmək, məişət, məşğulluq, rifah və sosial müdafiəsi sahəsində hüquqlarının müdafiəsini nəzərdə tutur, bu hüquqlar insanların özlərinin iqtisadi vəziyyətinin, rifah halının yaxşılaşdırılması

uğrunda mübarizə prosesində formalaşan hüquqlarıdır (2; Donnelly, 2013). Dövlətin sosial hüquqların təmin edilməsi sahəsində əsas vəzifəsi də öz növbəsində elə bir sosial proqrama istinad etməlidir ki, bu yolda məqsədyönlü fəaliyyət insanın sosial hüquqlarına ziyan gətirməsin, əksinə onu tam mənada yerinə yetirməyə kömək etsin və lazımi tələbatları ödəsin (Əliyev, 2019: 118). Heç təsadüfi deyil ki, ölkəmizdə bu gün uğurla həyata keçirilən sosial siyasətin əsası məhz Ulu Öndər Heydər Əliyevin hakimiyyət illərində qoyulmuşdur. Onun rəhbərliyi dövründə ölkədə əhalinin sosial vəziyyətinin yaxşılaşdırılması istiqamətində bir çox tədbirlər görülmüş, milli hüquqi baza formalaşdırılmış, bu istiqamətdə əsaslı islahatlar aparılmışdır. Onun "Əhalinin sosial müdafiəsini gücləndirmək və iqtisadiyyatın maliyyə vəziyyətinin sabitləşməsini təmin etmək tədbirlərinə həsr olunmuş" 20 May 1994-cü il tarixli müşavirədə giriş sözü ilə çıxış etdiyi zaman müharibə şəraitində yaşayan ağır sosial vəziyyətli əhalinin güzəranının yaxşılaşdırılması, iqtisadiyyatın gücləndirilməsi, əhalinin sosial vəziyyətinin yüksəldilməsi sahəsindəki göstəriş və tapşırıqları ağır vəziyyətdə olan ölkə əhalininin dərdinə şərik olduğunun ən bariz nümunələrindəndir. Bu siyasətin ən bariz nümunəsi 1995-ci il 12 noyabrda Azərbaycan Respublikasında qanunvericilik sisteminin əsasını təşkil edən ən ali qüvvəli sənəd – Konstitusiyanın qəbul olunması olmuşdur. Həmin Konstitusiyanın 12-ci maddəsində dövlətin iki ali məqsədindən birinin *Azərbaycan Respublikası vətəndaşlarının layiqli həyat səviyyəsinin təmin edilməli olduğu* qeyd edilmişdir. Eyni zamanda 15-ci maddəsinin birinci bəndində *Azərbaycan Respublikasında iqtisadiyyatın inkişafı müxtəlif mülkiyyət növlərinə əsaslanaraq xalqın rifahının yüksəldilməsinə xidmət etdiyi, ikinci bəndində isə Azərbaycan dövləti bazar münasibətləri əsasında sosial yönümlü iqtisadiyyatın inkişafına şərait yaratdığı* vurğulanmışdır. Bundan başqa 16-cı maddədə *Azərbaycan dövlətinin xalqın və hər bir vətəndaşın rifahının yüksəldilməsi, onun sosial müdafiəsi və layiqli həyat səviyyəsinin qayğısına qaldığı* göstərilmişdir. Eyni zamanda Konstitusiyanın 158-ci maddəsində qeyd edilmişdir ki, "bu Konstitusiyanın birinci bölməsində əks edilmiş müddəalarla əlaqədar Azərbaycan Respublikası Konstitusiyasına əlavələr təklif edilə bilməz" (Azərbaycan-Yunesko: İnsan hüquqlarına əsaslanan tərəfdaşlıq, 2014). Qeyd etməliyik ki, yuxarıda sadaladığımız bütün maddələr məhz birinci bölməyə daxildir. **Sosial təminat hüququ** adlanan 38-ci maddədə isə *hər kəsin sosial təminat hüququnun olduğu* qeyd olunur, *dövlətin sosial təminatın bütün növlərinin inkişafı üçün imkanlar yaratdığı* göstərilir (5; 6). Bununla yanaşı sosial hüquqlara daxil edilən şəxsi toxunulmazlıq hüququ Konstitusiyanın 32-ci, nigah hüququ 34-cü, əmək hüququ 35-ci, tətil hüququ 36-cı, istirahət hüququ 37-ci, sosial təminat hüququ 38-ci, sağlamlığın qorunması hüququ 41-ci, mənzil hüququ 43-cü, maddələrində öz əksini tapmışdır. Qeyd etmək lazımdır ki, 2009-cu il martın 18-də referendumda qəbul edilmiş əlavələr və dəyişikliklərlə **dövlətin ali məqsədi adlanan** 12-ci maddənin I hissəsinə *Azərbaycan Respublikasının vətəndaşlarına layiqli həyat səviyyəsinin* sözləri, **İqtisadi inkişaf və dövlət** adlanan 15-ci maddəsinə *sosial yönümlü* sozləri, əlavə edilmişdir (5; 6).

Ölkənin əsas qanunundan başqa ümummilli lider Heydər Əliyevin hakimiyyəti illərində ölkədə sosial yönümlü proqramlar qəbul edilmiş, bu sferanı tənzimləyəcək normativ-aktlar qəbul edilərək milli hüquqi baza zənginləşdirilmiş, çoxsaylı beynəlxalq əlaqələr qurulmuş, inkişaf etmiş sosial dövlətlərin praktikası uğurla mənimsənilərək tətbiq edilmişdir. O, çıxışlarının birində qeyd edirdi ki, "Azərbaycan Respublikası öz dövlət quruculuğunda, sosial-iqtisadi problemlərin həllində tutduğu strateji yolla gedir. Bizim bu yolumuz Azərbaycanda demokratik, hüquqi, sivilizasiyalı dövlət qurmaqdan, demokratik prinsipləri gündən-günə inkişaf etdirməkdən, dünyanın əldə etdiyi bütün demokratik nailiyyətləri Azərbaycanda yaymaqdan, onlardan bəhrələnməkdən ibarətdir" ("Müasir hüquq sisteminin formalaşmasında Heydər Əliyevin rolu" elmi-praktiki konfransın materialları, 2013: 138). 10 dekabr 1992-ci ildə təsis edilmiş Azərbaycan Respublikası Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi Heydər Əliyevin dövründə daha da təkmilləşdirilərək inkişaf etdirilmişdir. Məhz Ulu Öndərin sosial sahəyə davamlı diqqət və qayğısı müstəqil Azərbaycan dövlətinin sosial siyasətinin formalaşması və təkmilləşməsinə səbəb olmaqla, sosial müdafiə sistemində müsbət dəyişikliklərə yol açmışdır. Bu, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin fəaliyyətində də ciddi dönüşün yaranmasını, əmək və əhalinin sosial müdafiəsi istiqamətində məqsədyönlü tədbirlərin həyata keçirilməsini şərtləndirdi (8).

Bununla belə Ulu Öndər Heydər Əliyevin hakimiyyəti dövründə sosial yönümlü bir sıra islahatlar keçirilmiş, cəmiyyətinin ayrı-ayrı təbəqələrininin sosial hüquqlarının təminatı və sosial müdafiəsinin təmin olunması sahəsində bir sıra mühüm normativ və qeyri-normativ hüquqi aktlar qəbul edilmişdir. Həmin aktları Azərbaycan Respublikası Konstitusiyasının 148-ci maddəsinə uyğun olaraq iyerarxik qaydada sadalamağı daha məqsədə müvafiq hesab edirik. Belə ki, həmin dövrdə Milli Məclisdə "Sosial sığorta haqqında" 16 noyabr 2001-ci il tarixli Azərbaycan Respublikası qanunu, "Tibbi sığorta haqqında" 28 oktyabr 1999-ci il tarixli Azərbaycan Respublikası qanunu, "Özəl tibb fəaliyyəti haqqında" 30 dekabr 1999-cu il tarixli Azərbaycan Respublikası qanunu, "Məcburi köçkünlərin və onlara bərabər tutulan şəxslərin sosial müdafiəsi haqqında", "Əmək miqrasiyası və mühacir zəhmətkeşlərin sosial müdafiəsi sahəsində əməkdaşlıq haqqında Sazişin təsdiq edilməsi" barədə 8 oktyabr 1996-cı il tarixli qanunu, "Məcburi dövlət sosial sığorta ödəmələri üzrə borcların tənzimlənməsi haqqında" 9 dekabr 1997-ci il və 16 may 2000-ci il tarixli qanunu qəbul edilmişdir. Bununla yanaşı həmin illərdə "Çörəyin və çörək məmulatının qiymətlərinin tənzimlənməsi və əhalinin aztəminatlı təbəqələrinin sosial müdafiəsinin gücləndirilməsi sahəsində əlavə tədbirlər haqqında" 22 noyabr 1993-cü il tarixli, "Əhalinin sosial müdafiəsinin gücləndirilməsi və iqtisadiyyatın maliyyə vəziyyətinin sabitləşdirilməsi tədbirləri haqqında" 15 iyun 1994-cü il tarixli, "Pedaqoji işçilərin və ahıl vətəndaşların sosial müdafiəsi haqqında" 17 iyun 1997-ci il tarixli, "Məcburi dövlət sosial sığorta ödəmələri üzrə borcların tənzimlənməsi haqqında" Azərbaycan Respublikası Qanununun tətbiq edilməsi barədə 15 iyul 2000-ci il tarixli fərmanlar qəbul edilmişdir (Henkin, Gerald, Numan, Diane, Orentliçer, Libron, 2018: 1232). Qeyri-normativ aktlar sırasına nəzər salsaq isə, "Qaçqınların və məcburi köçkünlərin problemlərinin həlli üzrə Dövlət Proqramının hazırlanması haqqında" 1 iyul 1998-ci il tarixli, "Məcburi köçkünlərin sosial müdafiəsinin gücləndirilməsi haqqında" 17 fevral 1999-cu il, "Azərbaycan Respublikasında yoxsulluğun azaldılması sahəsində dövlət proqramının hazırlanması üzrə komissiyanın yaradılması haqqında" 2 mart 2001-ci il tarixli, "Azərbaycan Respublikasında yoxsulluğun azaldılması sahəsində dövlət proqramının hazırlanması üzrə komissiyanın yaradılması haqqında" 2 mart 2001-ci il tarixli, "Köçkünlərin sosial təminatının yaxşılaşdırılması haqqında" 13 may 2002-ci il tarixli sərəncamları misal göstərə bilərik. Xüsusilə ölkədə əhalinin sosial cəhətdən nisbətən həssas təbəqəsinin problemlərinin həll edilməsi və sosial müdafiəsini həyata keçirilməsi məqsədilə sığorta prinsipinə əsaslanan yeni pensiya siyasətinin əsasları müəyyən edilmiş, *"Azərbaycan Respublikasında pensiya islahatları Konsepsiyası"* ümummilli lider Heydər Əliyevin 2001-ci il 17 iyul tarixli Sərəncamı ilə təsdiq olunmuşdur. Bununla yanaşı əlil şəxslərin sosial müdafiəsi ümummilli lider Heydər Əliyevin 14 may 1998-ci il tarixli Sərəncamı ilə "1998-2001-ci illər üçün əlilliyin qarşısının alınması, əlillərin reabilitasiyası və sosial müdafiəsi üzrə Dövlət Proqramı"nın təsdiq edilməsi və s. kimi tədbirlər vasitəsilə təmin olunmuşdur (5; 6). Lakin sosial yönümlü tədbirlər bununla da bitmir, bu sahədə beynəlxalq əməkdaşlığa da xüsusi diqqət yetirilirdi. Belə ki, "Beynəlxalq Əmək təşkilatının məcburi əməyin ləğv olunması haqqında" 105 saylı Konvensiyasına qoşulma barədə, Birləşmiş Millətlər Təşkilatının "Mülki və Siyası hüquqlar haqqında" Paktına uyğun olaraq Azərbaycan Respublikasının qəbul etdiyi öhdəliklərin yerinə yetirilməsi ilə bağlı hesabatın hazırlanması və təqdim edilməsi barədə, Sosial inkişaf üzrə umumdünya konfransına hazırlıq tədbirləri barədə xüsusi əhəmiyyətli tədbirlər görülürdü (5; 6). Sosial sferanın inkişaf etdirilməsi məqsədi ilə xarici dövlətlərlə beynəlxalq əməkdaşlıq qurulur, Azərbaycan Respublikasında çoxsaylı ikitərəfli və çoxtərəfli müqavilələr bağlayır, ölkədə bu istiqamətdə maarifləndirmə tədbirləri həyata keçirilirdi (Əliyev, 2008: 368).

Heydər Əliyev cəmiyyətin hər hansı bir üzvünün ən zəruri sosial-iqtisadi maraqlarının həyata keçirilməsini təmin edən, o cümlədən şəxsiyyətin inkişafını və həyat səviyyəsini normal qurmaq üçüntəkrar istehsalla məşğul olmağı ön plana çəkir. O, lazım gələn ictimai və hüquqi zəmanətlərin məcmusunu özündə ehtiva edən sosial fondun yaradılmasını, əhalinin sosial problemlərinin həllini reallaşdırmağı vacib hesab edir,iş günü saatlarının azalması, əmək haqqının minimum səviyyəsinin təyin olunması və artırılması, sosial müavinətlərin və başqa sosial ödənişlərin miqdarının çoxalması və ödənilməsində həmkarlar ittifaqları və başqa ictimai təşkilatların rolunu da xüsusi qeyd edirdi.

Onun sosial proqramında təsbit olunmuş müddəalar yalnız sosial ədalət prinsipinə əsaslandığı üçün burada iş görmək istəyən təşkilatlar son dərəcə ehtiyatla hərəkət edir, sosial müdafiəyə daha çox ehtiyacı olan qruplara qocalar, əlillər, çoxuşaqlı və gənc ailələr, tək analar, azgəlirli işçilərə üstüsnlük verir və onlara təminatı ilə birinci növbədə məşğul olmağı zəruri bilirlər (Ümummilli lider Heydər Əlirza oğlu Əliyevin irsi və milli idealogiyanın formalaşması məsələləri (2010-cu il mayın 5-də keçirilmiş Ümumrespublika elmi-nəzəri konfransının materialları), 2010: 318; Abashidze, Goltyayev, 2013: 135).

## Nəticə

Ulu Öndər Heydər Əliyev tərəfindən həyata keçirilən yuxarıda sadaladığımız bütün addımlar sosial Azərbaycan dövlətinin formalaşdırılması, sosial siyasətin həyata keçirilməsi və əhalinin bütün təbəqələrinin layiqli həyat hüququnun təmin olunması məqsədi güdən tədbirlər idi ki, mərhum prezident hələ sağlığında uzaqgörən siyasəti ilə ölkənin gələcək prioritet istiqamətlərini müəyyənləşdirə və sosial siyasətin əsasını qoya bilmişdir. Bu gün ölkəmizdə ən böyük qeyri-hökümət təşkilatlarından biri olan və Ulu Öndərin adını daşıyan "Heydər Əliyev Fondu" vətəndaşların sosial hüquqlarının təmin olunması və realizəsi sahəsində geniş tədbirlər planı həyata keçirir. Fondun Prezidenti, Azərbaycan Respublikasının Birinci Vitse-Prezidenti, birinci xanım Mehriban Əliyevanın bu sahədə gördüyü misilsiz işlərin şahidi olmaqda davam edirik. Əsası Ulu Öndər tərəfindən qoyulmuş sosial islahatların uğurla həyata keçirilməsi və vətəndaşların rifahının yaxşılaşdırılmasına yönəlmiş bu tədbirlər Heydər Əliyev şəxsiyyətinin yüksək zirvəsindən xəbər verir. O, nəinki sağlığında hətta cismən deyil mənəvi cəhətdən yanımızda olduğu vaxtda belə öz həmvətənlərini düşünür, onlara xidmət edir. "Heydər Əliyev İli" elan edilmiş 2023-cü ildə bu islahatlar cənab prezidentimiz İlham Əliyev tərəfindən daha da uğurla davam etdirilir. Bu gün həyata keçirilən sosial yönümlü daxili siyasət tədbirləri ümummilli lider Heydər Əliyevin hakimiyyətdə olduğu 1993-2003-cü illərdə onun tərəfindən həyata keçirilən uzaqgörən siyasətin nəticəsidir. Bu gün onun layiqli davamçısı cənab prezident İlham Əliyev də uğurlu sosial siyasət yeridir. Bu sahədə köklü islahatlar məhz onun adı ilə bağlıdır. İlham Əliyev qeyd edir ki, "sosial siyasət həmişə prioritet olub və olacaq. Bütün atılan addımlar bir daha onu göstərir ki, Azərbaycan sosial dövlətdir. Siyasətimizin mərkəzində Azərbaycan vətəndaşı dayanır. Azərbaycan vətəndaşının maraqları bizim üçün hər şeydən üstündür. Azərbaycanda iqtisadi islahatların həyata keçirilməsi insanların daha da yaxşı yaşamaları məqsədi daşıyır". Bu fikir 1995-ci il Konstitusiyasının 12-ci maddəsində qeyd edilmiş "**vətəndaşların layiqli həyat səviyyəsinin təmin edilməsi dövlətin ali məqsədidir"** fikrini bir daha vurğulayır.

Ulu Öndərin layiqli davamçısı cənab prezident İlham Əliyevin hakimiyyət rəhbərliyinə təyin edildiyi ilk illərdən başlayaraq ölkədə əhəmiyyətli dəyişikliklər baş vermiş, sosial yönümlü çoxsaylı fərman və sərəncamlar, həmçinin digər normativ-aktlar qəbul edilmiş, müxtəlif proqramlar həyata keçirilmişdir. Bütün bunların nəticəsində əhalinin sosial cəhətdən həssas təbəqələrinin maddi vəziyyətində irəliləyişlər müşahidə olunmuş, ayrı-ayrı kateqoriya şəxslərin sosial durumu yüksəlmişdir. Xüsusilə şəhid ailələri, qazilər, ahıl şəxslər, cəmiyyətin ziyalı təbəqəsi daim onun diqqət mərkəzində olmuşdur. Heç təsadüfi deyil ki, ölkə rəhbərliyinə gəldiyi zaman cənab prezidentin sosial sahədə imzaladığı ilk fərman məhz şəhid ailələri ilə bağlı olmuşdur. Sosial yönümlü islahatlar gələcəkdə uğurla davam etdirilməli, Ulu Öndərin ***"Bizim dövlətimizin siyasəti iqtisadiyyatı inkişaf etdirməklə yanaşı, birinci növbədə sosial problemləri həll etməkdən ibarətdir"*** sözləri hər bir azərbaycanlının həyat amalına çevrilməlidir.

## Ədəbiyyat

1. Əliyev, Ə.İ. (2019). İnsan hüquqları. Dərslik. Bakı: Nurlar nəşriyyat-Poliqrafiya mərkəzi, 352 s.
2. Donnelly, J. (2013). Universal Human Rights in theory and practice. Third edition. London: Cornell University Press, 320 p.
3. https://teyinat.com/posts/sosial-iqtisadi-ve-medeni-huquqlar

4. Azərbaycan-Yunesko: İnsan hüquqlarına əsaslanan tərəfdaşlıq. (2014). Bakı, 287 s.
5. Azərbaycan Respublikasının Ədliyyə Nazirliyi Normativ hüquqi aktların vahid internet elektron bazası https://e-qanun.az/
6. Azərbaycan Respublikası Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin rəsmi saytı https://sosial.gov.az/
7. "Müasir hüquq sisteminin formalaşmasında Heydər Əliyevin rolu" elmi-praktiki konfransın materialları. (2013). Bakı: Ədliyyə nəşriyyat evi MMC, 138 s.
8. Prezidentin rəsmi səhifəsi https://president.az/
9. Henkin, L., Gerald, L., Numan, Diane, F., Orentliçer, D., Libron, V. (2018). İnsan hüquqları. Bakı, 1232 s.
10. Əliyev, Ş.İ. (2008). İnsan hüquqları sistemində sosial hüquqlar (nəzəri və praktiki məsələlər). Dərs vəsaiti. Bakı: Bakı Universiteti nəşriyyatı, 368 s.
11. Ümummilli lider Heydər Əlirza oğlu Əliyevin irsi və milli idealogiyanın formalaşması məsələləri (2010-cu il mayın 5-də keçirilmiş Ümumrespublika elmi-nəzəri konfransının materialları). (2010). Bakı: Elm və təhsil, 424 s.
12. Abashidze, A.KH., Goltyayev, A.O. (2013). Universalniye mekhanizmy zashchity prav cheloveka. Uchebnoye posobiye. M., YUNITI-DANA, 135 s.

Göndərilib: 09.08.2023 Qəbul edilib: 24.09.2023

DOI: https://doi.org/10.36719/2663-4619/95/37-41

**Aygün Əlizadə**
Azərbaycan Dövlət Pedaqoji Universitetinin Ağcabədi filialı
doktorant
aygun.alizada.aa@gmail.com

# İNSAN DAVRANIŞINA TƏSİR EDƏN FAKTORLARIN PSİXOLOJİ TƏHLİLİ

**Xülasə**

İnsan davranışının psixologiyası ilə bağlı mövzular daim inkişaf edən və aktual olan sahələrə daxildir. Davranış psixologiyası sahəsində daim yeni araşdırmalar və kəşflər edilir. Beyin fəaliyyəti, duyğular, motivasiya, öyrənmə və yaddaşla bağlı araşdırmalar davranışın necə baş verdiyi və onun necə dəyişə biləcəyi ilə bağlı yeni məlumatlar verir. Mədəni və sosial dəyişikliklər insan davranışının necə formalaşmasına təsir göstərir. Qloballaşma, rəqəmsallaşma, miqrasiya, müxtəliflik kimi amillər insanların davranışlarına, psixoloji proseslərə təsir edir. Buna görə də davranış psixologiyası sahəsində mədəni və sosial dəyişiklikləri başa düşmək və izah etmək vacibdir.

***Açar sözlər:*** *insan davranışı, sosiallaşma, şəxsiyyət, faktor, davranış nəzəriyyələri*

**Aygun Alizadeh**
Aghjabedi branch of Azerbaijan State Pedagogical University
PhD student
aygun.alizada.aa@gmail.com

## Psychological analysis of factors affecting human behavior

**Abstract**

Topics related to the psychology of human behavior are among the constantly evolving and relevant fields. New research and discoveries are constantly being made in the field of behavioral psychology. Research on brain activity, emotions, motivation, learning, and memory provides new insights into how behavior occurs and how it can change. Cultural and social changes affect how human behavior is shaped. Factors such as globalization, digitization, migration, and diversity affect people's behavior and psychological processes. Therefore, it is important to understand and explain cultural and social changes in the field of behavioral psychology.

***Keywords:*** *human behavior, socialization, personality, factor, behavioral theories*

## Giriş

Davranış bir insanın bütün müşahidə edilə bilən hərəkətləridir. Gün ərzində davamlı olaraq sərgilədiyimiz hər şey, məsələn, dost gördüyümüz zaman əl uzatmaq, telefon zəngi çalanda telefona əl uzatmaq və danışmağa başlamaq, qapının zəngini çalanda ayağa qalxmaq, tıxacda əsəbiləşən sürücüyə işarə etmək kimi, yeməyimizin duzsuz olduğunu düşündüyümüz zaman duz qabını götürüb duz səpmək və s. Hər hansı bir hərəkət davranışdır. Uşaqlıqdan fərd böyüdüyü və inkişaf etdiyi icmaların dəyərləri ilə yoğrulur. Əvvəlcə ailə, sonra məktəb və mənsub olduğu sosial qruplar, sonra isə qurumlardakı hakim qaydalar və dəyərlər. Sosial həyatda fərdin hərəkətləri bir sıra qaydalarla idarə olunur. Yəni uşaqlıqdan yetkinliyə doğru inkişaf prosesində müxtəlif üsullarla hansı davranışların müxtəlif mühitlərə uyğun, hansı davranışların məqbul olduğu öyrədilir. Din, əxlaq və hüquq insan davranışını idarə edən əsas sistemlərin başında dayanır. Məsələn, başqasının xəbəri olmadan özünə aid olmayan bir əşyanın alınması, yəni oğurlanması bütün bu qayda sistemləri tərəfindən arzuolunmaz davranış kimi qəbul edilir. Dinimizə görə oğurluq günahdır; Mənəvi nöqteyi-nəzərdən oğurluq edən insanlar cəmiyyət tərəfindən qınanır və kənarlaşdırılır, oğurluğu törətdiyi cinayətin ağırlığına uyğun olaraq cəzalandırmaq üçün qanunlar yazılır və tətbiq

edilir. Bu nümunədən də göründüyü kimi, fərdin sosial həyatda hansısa davranışları arzuolunmaz davranışlar kimi müəyyən edilir və ailədə, məktəbdə və ictimai həyat təcrübələri ilə fərdə öyrədilir. Başqa sözlə, fərd bu qaydalarla ictimailəşir. Digər tərəfdən, cəmiyyət hansı davranışların arzu olunan davranış olduğunu müəyyənləşdirir (Schwartz, 2014: 321). Məsələn, vergi ödəmək, yol hərəkəti qaydalarına riayət etmək, ehtiyacı olanlara kömək etmək, vəzifələri yerinə yetirmək kimi bir çox davranış fərdlərdən gözlənilən və arzu olunan davranışlardır. Bu davranışların arzu olunan davranış kimi tərifi dini, əxlaqi və hüquqi sistemlərdən ən azı biri tərəfindən verilmişdir.“Arzu olunan və arzuolunmaz davranışlar” fenomeninə bu prizmadan baxsaq, fərddə arzu olunan davranışların qurulması və arzuolunmaz davranışların baş vermə ehtimalının aşağı olması, digər tərəfdən fərdi dəyərlərdən çox ierarxik bir quruluşun məhsuludur. Bu mənada qaydalar və dəyərlər sistemi davranışı formalaşdırır (Bayramov, Əlizadə, 2008: 452).

Davranışın tarixi inkişafı çox məşəqqətli və çox yönlü bir prosesdir. İnsan davranışının kökləri insanlığın tarixinin dərinliklərinə qədər uzanır və onun inkişafı sosial, mədəni və fərdi təsirləri ilə ölçülür. İnkişaf baxımından insan davranışının əsasını sağ qalmaq və çoxalmaq instiktləri təşkil edir. İnsan növü adaptasiya və seçim prosesləri nəticəsində bəzi davranış şablonlarını inkişaf etdirib. Məsələn, sosial əlaqələr qurmaq, qrup içində əməkdaşlıq etmək və təhlükələrdən qaçmaq kimi davranışlar insanların sağ qalma və çoxalma şansını artırır. Sosial baxımdan insanlar cəmiyyətlər yaratmış və bu cəmiyyətlər içində kompleks əlaqələr qurmuşdur. Cəmiyyətlərin mədəni dəyərləri, normaları, dil və kommunikasiya formaları davranış qəliblərinə təsir etmişdir. İnsan davranışı, cəmiyyətin gözləntiləri, rolları, normaları ilə təchiz olunmuşdur. Məsələn, etik dəyərlər, cəmiyyətdə cinsiyət rolları, etik qaydalar və sosial normalar kimi faktorlar insanların davranışlarını tənzimləyir. Hər bir insanın şəxsi təcrübələri, təhsili, öyrənmə prosesləri və genetik strukturu davranışlarına təsir edir. İnsanlar ətrafları ilə əlaqədə olduqda çox güclü öyrənmə və adaptasiya bacarıqlarına yiyələnirlər. Fərdlər mühitin təsirlərinə cavab olaraq davranışlarını tənzimləyir və təcrübələrinə əsasən davranışlarını dəyişdirirlər. Davranışın tarixi inkişafı, zamana və cəmiyyətlər arasında münasibətlərə uyğun olaraq müxtəlif tərzlərdə ifadə olunur. İnsanlar texnoloji, elmi və mədəni irəliləmələrlə birlikdə davranışlarını dəyişib uyğunlaşdırmışdır. Məsələn, kənd təsərrüfatı inqilabı, sənaye inqilabı və bilik dönəmi kimi dövrlərdə insan davranışları çox dəyişib. Nəticə olaraq, davranışın tarixi inkişafı mürəkkəb bir prosesdir, o, sosio-mədəni və fərdi təsirlərdən təşkil olunmuşdur. İnsan davranışları tez-tez dəyişə bilən bir mövzudur və müxtəlif elm sahələri tərəfindən anlaşılması üçün üzrəində tədqiqatlar aparılmalıdır. İnsan davranışına təsir edən amillər olduqca müxtəlifdir (Bayramov, Əlizadə, 2003: 342). Əsas amillərdən bəziləri bunlardır:

- Genetik faktorlar: İnsan davranışının bəzi aspektlərinə genetik faktorlar səbəb ola bilər. Məsələn, şəxsiyyət xüsusiyyətləri, intellekt səviyyəsi, meyllər kimi məsələlərdə genetik faktorların təsiri vacibdir.
- Ətraf mühit amilləri: İnsan davranışına ətraf mühit amilləri də təsir edə bilər. Bu amillər ailə və dostlar kimi yaxın əlaqələr, sosial və mədəni amillər, təhsil və təcrübələr kimi bir çox şeyi əhatə edə bilər.
- Psixoloji amillər: Psixoloji amillər də insan davranışını anlamaq üçün vacibdir. Bunlar emosional vəziyyət, psixi sağlamlıq, davranış və düşüncə nümunələri kimi mövzuları əhatə edir.
- Bioloji amillər: İnsan davranışına bioloji amillər də təsir edə bilər. Bu amillər hormonal balanssızlıqlar, beyin kimyası, xəstəliklər və ya fiziki qüsurlar kimi məsələləri əhatə edə bilər.

Bütün bu amillər insan davranışına təsir edən və formalaşdıran komponentlərdir. Ancaq hər bir insanın fərqli təcrübəsi və şəxsiyyəti olduğundan, onların davranışını tam izah etmək həmişə asan olmur. Ətraf mühit faktorlarının insan davranışına əhəmiyyətli təsir göstərdiyinə inanan və mübahisə edən bir çox elm adamı var. Bu alimlərə sosial psixoloqlar, antropoloqlar, sosioloqlar və praktik psixoloqlar daxildir. Məsələn, sosial psixoloq Kurt Levin insan davranışının ətraf mühit faktorlarından təsirləndiyini müdafiə etdi. Levin "davranış şəxsi xüsusiyyətlərin və ətraf mühit amillərinin qarşılıqlı təsiri nəticəsində yaranır" fəlsəfəsini qəbul etdi. Eynilə, sosioloq Emil Durkheim sosial strukturların insan davranışını müəyyən etdiyini müdafiə etdi. Durkheim insanların sosial və mədəni əlaqələrinin onların davranışlarını müəyyən etdiyini və bu əlaqələrin ətraf mühit

faktorları ilə formalaşdığını düşünürdü. Nəhayət, praktik psixoloqlar da insan davranışını ətraf mühit faktorları ilə əlaqələndirdilər. Bu psixoloqlar insan davranışının fiziki və sosial mühitin təbiətindən və xüsusiyyətlərindən asılı olduğunu müdafiə edirdilər. Bu alimlərin araşdırmaları göstərir ki, insan davranışına təkcə genetik faktorlar deyil, həm də ətraf mühit faktorları təsir edir (Bayramov, 1981: 143). Ətraf mühit faktorlarının insan davranışına ən çox təsir etməsi bir çox səbəblərə əsaslanır. Bu səbəblərdən bəziləri bunlardır:

- İnsanlar sosial varlıqlardır: İnsanlar digər insanlarla qarşılıqlı əlaqələri sayəsində inkişaf edir və ətrafdakı insanlarla münasibətləri onların davranışlarına böyük təsir göstərir (Yusifova, 2010: 41).
- Öyrənmə: İnsanlar ətrafdakı öyrənmə imkanlarından istifadə edərək davranışlarını formalaşdırırlar. Bu, onların ətrafdakı müsbət və ya mənfi stimullara məruz qalması ilə baş verir.
- Mədəniyyət: Mədəni amillər insan davranışına böyük təsir göstərir. Cəmiyyətin gözləntiləri, dəyərləri və normaları insanların davranışını müəyyən edən ən mühüm ekoloji amillərdən biridir.
- İqlim və coğrafiya: İqlim və coğrafiya da insan davranışına təsir edən amillərdir. Məsələn, isti iqlimlərdə insanlar adətən daha yavaş, soyuq iqlimlərdə isə daha sürətli hərəkət edirlər.
- İqtisadiyyat: İqtisadi amillər də insan davranışına təsir edən amillər sırasındadır. Məsələn, bir insanın maddi vəziyyəti onun davranışına əhəmiyyətli dərəcədə təsir edə bilər.

Bu səbəblərdən ətraf mühit faktorları insan davranışına ən çox təsir edir. Lakin bütün bu amillərin insan davranışına təsir etdiyini nəzərə alsaq, hansı amilin digərindən daha vacib olduğunu müəyyən etmək çətin ola bilər. Eyni zamanda insan münasibətləri dinamik proses olduğu üçün qeyd olunan bütün kateqoriyalarda insan – insan yanaşmasının mövcudluğu davranışın social faktorların təsirinə daha çox məruz qalması haqqında fikri formalaşdırır. Nəzərə almaq lazımdır ki, bir çox amillər bir-biri ilə qarşılıqlı təsir göstərir. Bununla belə, davranışımıza hansı amillərin təsir edə biləcəyini müəyyən etmək üçün aşağıdakı üsullardan yararlana bilərik:

Müşahidə edin: Ətrafınızdakı hadisələrə və insanların davranışlarına diqqətlə baxın. Bu, davranışınıza hansı amillərin təsir etdiyini anlamağa kömək edə bilər.

Müsahibə: Ətrafınızdakı insanlarla danışın və onların davranışlarına hansı amillərin təsir etdiyini soruşmağa çalışın. Bu, müxtəlif perspektivlər götürməyə və müxtəlif amillərin davranışınıza təsirini başa düşməyə kömək edə bilər.

Daxilə fokuslanın: Özünüzü və davranışınızı daha yaxşı başa düşmək üçün daxili aləminizə diqqət etməyə çalışın. Bu, davranışınıza hansı amillərin təsir etdiyini başa düşməyə kömək edə bilər.

Araşdırma aparın: Davranışa hansı amillərin təsir etdiyini anlamaq üçün elmi araşdırmaya müraciət edə bilərsiniz. Bu, hansı amillərin davranışınıza daha çox təsir etdiyini müəyyən etməyə kömək edə bilər. Hər kəsin təcrübəsi və davranışı fərqlidir və bu amillərin hər biri insandan insana fərqli təsir göstərə bilər.

Davranış nəzəriyyələri insan davranışının necə formalaşdığını, dəyişdirildiyini və formalaşdığını anlamaq üçün istifadə olunan nəzəri yanaşmalardır. Bu nəzəriyyələr müxtəlif amillərin (genetik, ətraf mühit, sosial, mədəni) insan davranışına necə təsir etdiyini izah etmək məqsədi daşıyır. Davranış nəzəriyyələri motivasiya, öyrənmə, sosial qarşılıqlı əlaqə və insan davranışının əsasını təşkil edən idrak prosesləri kimi məsələləri həll edir. Bu nəzəriyyələr psixologiya, sosiologiya, antropologiya və təhsil kimi müxtəlif elm sahələrində çalışan tədqiqatçılar tərəfindən öyrənilir və inkişaf etdirilir (Richard, 2000: 245). İbtidai öyrənmə nəzəriyyələrinə Klassik şərtlənmə, Operant şərtlənmə və Müşahidə vasitəsilə öyrənmə daxildir. Klassik şərtlənmə stimul və cavab arasında əlaqə yaratmağı əhatə edir. Məsələn, bir it həmişə yeməklə birlikdə zəngi eşidirsə, hətta yalnız zəngi eşitdikdə belə tüpürcək axıda bilər. Operant şərtlənmə davranış nəticələri arasında əlaqə yaratmağı əhatə edir. Davranış müsbət nəticə ilə əlaqələndirildikdə (məsələn, mükafat), davranışın həyata keçirilməsi ehtimalı artır. Məsələn, əgər uşaq yaxşı qiymət aldığı üçün mükafatlandırılırsa, bu davranışın təkrarlanma ehtimalı daha yüksəkdir. Müşahidə yolu ilə öyrənmə ətrafdakı digər insanların davranışlarını modelləşdirməyə əsaslanır. Məsələn, uşaq böyüklərin

davranışını təqlid edərək davranışı öyrənə bilər. Əsas öyrənmə nəzəriyyələri və insan davranışlarınına nümunələr:

- Albert Bandura: Müşahidə yolu ilə öyrənmə nəzəriyyəsi - Bandura təklif edir ki, insan davranışlarının çoxu ətrafımızdakı digər insanları təqlid etməklə öyrənilir. Bu nəzəriyyə xüsusilə təhsil və psixoterapiya sahəsində geniş istifadə olunur (Adams, 1965: 135).
- B.F.Skinner: Operant şərtlənmə - Skinner davranışın nəticələrə görə formalaşdığını və mükafat və ya cəzanın davranışa təsir etdiyini iddia edir. Bu nəzəriyyə biznes və idarəetmə kimi bir çox sahədə istifadə olunur.
- İvan Pavlov: Klassik şərtlənmə - Pavlov stimul və cavab arasında əlaqə yaratmağı nəzərdə tutan bu nəzəriyyəni təklif etdi. Bu nəzəriyyə xüsusilə psixoterapiya sahəsində istifadə olunur (Bandura, 2000: 256).
- Jean Piaget: Koqnitiv İnkişaf Nəzəriyyəsi - Piaget təklif edir ki, insan davranışı idrak proseslərimizdən qaynaqlanır. Fərdlərin düşüncələri, inancları və dəyərləri davranışlarını formalaşdıran amillər hesab olunur. Bu nəzəriyyə xüsusilə təhsil sahəsində istifadə olunur.
- Psixoanalitik Nəzəriyyə: Ziqmund Freyd tərəfindən hazırlanmış bu nəzəriyyə şüursuz proseslərin və instinktlərin insan davranışına təsir etdiyini müdafiə edir. Davranışı anlamaqda şəxsiyyət quruluşu, daxili münaqişələr və müdafiə mexanizmləri mühüm rol oynayır.
- Humanist yanaşma: Carl Rogers və Abraham Maslow kimi psixoloqlar tərəfindən irəli sürülən bu yanaşma, insanların öz potensiallarını reallaşdırmaq üçün motivasiyaya malik olduğunu vurğulayır. Fərdin özünü həyata keçirmə ehtiyacı və özünə hörmət kimi anlayışlar davranışa təsir göstərir.
- Lev Vıqotski: sosial və mədəni qarşılıqlı əlaqələrin insan davranışını necə formalaşdırdığını öyrənən psixoloqdur. Vıqotski davranış nəzəriyyələri uşaqların idrak inkişafı və öyrənmə proseslərinin başa düşülməsində mühüm rol oynayır. Vıqotskinin əsas davranış nəzəriyyələri bunlardır: Sosial İnkişaf Nəzəriyyəsi: Vıqotski insan davranışının sosial qarşılıqlı əlaqə ilə müəyyən edildiyini müdafiə edir. Onun sözlərinə görə, uşaqlar böyüklər, müəllimlər və ətrafdakı həmyaşıdları ilə ünsiyyətdə olarkən onların idrak və nitq inkişafını təmin edirlər. Sosial qarşılıqlı əlaqə uşaqların zehni funksiyalarını və problem həll etmə qabiliyyətlərini inkişaf etdirməyə kömək edir (Bayramov, Əlizadə, 1986: 350).

## Nəticə

Nəticə olaraq, davranış nəzəriyyələri insan davranışını izah etmək və anlamaq üçün işlənmiş nəzəri yanaşmalardır. Bu nəzəriyyələr insan davranışının mürəkkəbliyini başa düşmək və daha təsirli müdaxilələr etmək üçün vacib bir vasitədir (William, 2004: 146).

Davranış pozuntuları insanın normal davranış modellərindən kənara çıxan, funksionallıq baxımından problem yaradan və adətən psixoloji və ya nevroloji faktorların səbəb olduğu vəziyyətlərdir. Bu pozuntular emosional, koqnitiv və sosial funksiyaların pozulmasına səbəb ola bilər. Bu problemlər uşaqlıqdan yetkinliyə qədər hər yaş qrupunda baş verə bilər və müxtəlif səbəblərə görə inkişaf edə bilər. Məsələn, diqqət əskikliyi hiperaktivlik pozuqluğu (DEHB), zehni gerilik, autizm spektri pozuntusu, obsesif-kompulsif pozuntu (OKB), depressiya, narahatlıq və şizofreniya kimi hallar davranış pozuntularına misal ola bilər. Davranış pozuntuları çox vaxt fərdin həyat keyfiyyətinə mənfi təsir göstərir. İş, təhsil və sosial əlaqələr kimi sahələrdə çətinliklərə səbəb ola bilər. Davranış pozuntuları üçün müalicə və dəstək üsulları fərqlidir. Bunlara dərman müalicəsi, terapiya (psixoterapiya, koqnitiv davranış terapiyası və s.), təhsil və reabilitasiya proqramları daxil ola bilər. Davranış pozuntularının başa düşülməsi və qiymətləndirilməsi adətən mütəxəssislər tərəfindən aparılır. Klinik psixoloqlar, psixiatrlar, pedaqoqlar və digər mütəxəssislər fərdin vəziyyətini qiymətləndirir, diaqnoz qoyur, müvafiq müalicə və dəstək variantlarını müəyyənləşdirir. Əhəmiyyətli bir məqam, davranış pozuntusu olan şəxslərin dəstəyə və anlayışa ehtiyacı olmasıdır (Əliyev, 2006: 384). Empatiya, dözümlülük və möhkəm dəstək şəbəkəsi bu şəxslərin həyat keyfiyyətini yaxşılaşdırmağa kömək edə bilər. Eyni zamanda, maarifləndirmə, erkən diaqnoz və erkən müdaxilə proqramları cəmiyyətdə davranış pozuntuları haqqında məlumatlılığın artırılması və

müvafiq dəstək xidmətlərinin göstərilməsi baxımından əhəmiyyətlidir. Davranış problemlərinin aradan qaldırılması vasitələrindən biri də SWOT analizi adlanır. SWOT təhlili təşkilatın güclü və zəif tərəflərini, imkanlarını və təhdidlərini qiymətləndirmək üçün istifadə edilən strateji planlaşdırma vasitəsidir. SWOT ingilis dilində Strengths (güclü tərəflər), Weaknesses (weaknesses), Opportunities (imkanlar) və Threats (threats) sözlərinin baş hərflərindən ibarətdir. SWOT təhlili təşkilatın daxili və xarici amillərini təhlil edərək strateji qərarlar qəbul etmək üçün istifadə olunur. SWOT təhlili aşağıdakı kimi aparılır:

- Güclü tərəflər: Öz güclü tərəflərinizi müəyyənləşdirin. Nədə yaxşı olduğunuzu, nəyi yaxşı bacardığınızı və sizə nəyin üstünlük verdiyini müəyyənləşdirin. Məsələn, ünsiyyət bacarıqları, analitik düşünmə qabiliyyəti, liderlik bacarıqları.
- Zəif tərəflər: Öz zəifliklərinizi və yaxşılaşdırılması üçün sahələrinizi müəyyənləşdirin. Hansı sahədə çətinlik çəkdiyinizi, çatışmadığınızı və ya təkmilləşdirməyə ehtiyacınız olduğunu müəyyənləşdirin. Məsələn, vaxtı idarə etmə bacarığı, özünə inamın olmaması, ünsiyyətdə çətinlik.
- İmkanlar: Ətrafınızdakı imkanları qiymətləndirin. Hansı sahələrdə böyümə potensialının və yeni genişlənmələr təmin edə biləcək vəziyyətlərin olduğunu müşahidə edin. Məsələn, yeni təhsil və ya karyera imkanları, şəbəkələşmə imkanları.
- Təhdidlər: Qarşılaşa biləcəyiniz təhlükələri və maneələri müəyyənləşdirin. Hansı amillərin sizi məhdudlaşdıra biləcəyini, risklər yarada biləcəyini və uğura mane ola biləcəyini düşünün (John, Watson, 2021: 453).

Davranış psixologiyası da sağlamlıq və rifahla da əlaqələndirilir. Psixi sağlamlıq, stressin idarə edilməsi, asılılıq, yuxu rejimi kimi məsələlər bu gün diqqət mərkəzindədir. Davranış psixologiyası tədqiqatları insanların sağlam və xoşbəxt həyat sürmələrini dəstəkləmək üçün böyük əhəmiyyət kəsb edir. Davranış psixologiyası, effektiv ünsiyyət, motivasiya, iş dünyasında komanda işi və liderlik kimi mövzulara da diqqət yetirir. Davranış psixologiyası ilə əlaqəli biliklər insanların iş performansını artırmaq və liderlik bacarıqlarını təkmilləşdirmək üçün böyük əhəmiyyət kəsb edir. Bu amillər insan davranışı və psixologiyası mövzusunu aktual saxlayır.

## Ədəbiyyat

1. Schwartz, J. (2014). "Behavioral Science: Behavioral Science: Understanding and Changing Human Behavior", 452 p.
2. Bayramov, Ə.S., Əlizadə, Ə.Ə. (2008). Psixologiya: Ali məktəblər üçün dərslik. Bakı: Çinar-çap, 620 s.
3. Bayramov, Ə.S., Əlizadə, Ə.Ə. (2003). Sosial psixologiya: Ali məktəblər üçün dərslik. Bakı: Qapp-Poliqraf, 356 s.
4. Bayramov, Ə.S. (1981). Şəxsiyyətin təşəkkülünün aktual psixoloji problemləri. Bakı: Azərnəşr, 190 s.
5. Yusifova, R.N. (2010). Müasir psixologiyada özünüaktuallaşdırma problemi və onun psixososial əsasları. Psixologiya jurnalı. № 1, s.41-52.
6. Richard, B. (2000). Herrnstein, William Vaughan "Principles of Behavior", 354 p.
7. Adams, J.S. (1965). Inequity in Social Exchange. Advances in Experimental Social Psychology, pp.267-299.
8. Bandura, Albert. (2000). Social learning theory, 379 p.
9. William, J. (2004). "Human will", 246 p.
10. Bayramov, Ə.S., Əlizadə, Ə.Ə. (1986). Sosial psixologiyanın aktual məsələləri. Bakı: Azərnəşr, 350 s.
11. Əliyev, R.İ. (2006). Psixologiya tarixi. Bakı: Nurlan, 384 s.
12. John, B., Watson. (2021). "Behavior Analysis", 453 p.

Göndərilib: 13.08.2023 Qəbul edilib: 21.09.2023

DOI: https://doi.org/10.36719/2663-4619/95/42-47

**İlahə Əliyeva**
Azərbaycan Turizm və Menecment Universiteti
doktorant
ilaha.92.aliyeva@gmail.com

# ƏRZAQ MƏHSULLARININ BAZAR DİNAMİKASI

**Xülasə**

Bazarın məkan təhlili onun miqyası və strukturu ilə müəyyən olunur. Bazarın strukturu konyunkturanın əsas keyfiyyət göstəricilərindən biridir. O, bazarın əsas proporsiyalarını, xüsusi halda isə onun əmtəə strukturunu əks etdirir.

Bazarın tərəddüdləri əhəmiyyətli dərəcədə onun müəyyən hədlərdə marketinqlə məhdudlaşan təbiiliyinin təzahürü kimi çıxış edir. Hesab olunur ki, o, bazar mexanizminin əsasında durur. Parametrlər həm təsadüfi məruz qalır, həm də dövri və mövsümi tərəddüdlərə məruz qalır.

***Açar sözlər:*** *bazar, marketinq, konyuktor, kənd təsərrüfatı, müəssisə*

**Ilaha Aliyeva**
Azerbaijan Tourism and Management University
PhD student
ilaha.92.aliyeva@gmail.com

## Market dynamics of food products

**Abstract**

The spatial analysis of the market is determined by its scale and structure. The structure of the market is one of the main qualitative indicators of the economic situation. It reflects the main proportions of the market, and in particular its commodity structure.

The fluctuations of the market act to a significant extent as a manifestation of its naturalness, which is limited to certain limits by marketing. It is considered to be the basis of the market mechanism. The parameters are subject to both random and periodic and seasonal fluctuations.

***Keywords:*** *market, marketing, business, agriculture, enterprise*

## Giriş

Marketinq təhlili toplanmış və düzgün qruplaşdırılmış, strukturlaşdırılmış və işlənmiş məlumatlardan nəticə əldə etmə prosesi, daha doğrusu marketinq tədqiqatının nəticəsidir. Marketinq təhlili bazarın vəziyyəti və inkişafının tendensiya və qanunauyğunluqlarını müəyyənləşdirmək, marketinq fəaliyyətinin məqbul risk səviyyəsini qiymətləndirmək, idarəetmə tədbirlərini elmi əsaslarla həyata keçirmək və müvafiq baza yaratmaq məqsədi ilə aparılır. Marketinq təhlili şirkətin müəssisənin və ya bütünlükdə sahənin strategiyasını inkişaf etdirmək üçün ilkin zəmini formalaşdırır. Əmtəə bazarının təhlili, şirkət və ətraf mühit arasındakı münasibətlər sistemini ortaya qoyur, habelə bazar hadisələrinə marketinq reaksiyasının qiymətləndirilməsini təmin edir (Azərbaycanın kənd təsərrüfatı müəssisələrin və fərdi sahibkar təsərrüfatlarının əsas iqtisadi göstəriciləri, 2019: 52).

Taktiki analiz elə işlək olmalıdır ki, lazım gəldikdə dərhal şirkətin / müəssisənin marketinqini idarə etmək üçün lazımi tədbirlər görülmüş olsun. Vaxt qıtlığı müəyyən dərəcədə tədqiqat metodologiyasını müəyyən edir: bu zaman ən sadə analiz metodları, təxmini qiymətləndirmələr, keyfiyyətli, qeyri-formalar xüsusiyyətlərdən istifadə olunur. Belə bir təhlil, hər şeydən əvvəl, prioritet vəzifələri həll edir və konyunktur xarakter daşıyır (Belyavskiy, 2004: 88-89).

ELMİ İŞ Beynəlxalq elmi jurnal. İmpakt Faktor: 2.255. 2023 / Cild: 17 Sayı: 10 / 42-47 ISSN: 2663-4619
SCIENTIFIC WORK International scientific journal. Impact Factor: 2.255. 2023 / Volume: 17 Issue: 10 / 42-47 e-ISSN: 2708-986X

Mürəkkəb münasibətləri və perspektiv proqnozların qurulması üçün kifayət qədər uzun bir dövrü əhatə edən bazarın daha dərindən araşdırılmasını strateji təhlil əsas qanunauyğunluqları təmin edir. Marketinq təhlili rəqabət təhlükəsini qiymətləndirməyə, rəqibin güclü və zəif tərəflərini tapmağa və rəqabət strategiyasını təxmin etməyə imkan verir.




***Şəkil 1.1. Marketinq təhlilinin tipologiyası***

Marketinq təhlilinin obyektləri: firmalar məcmusu, ümumilikdə sahə, habelə ayrı-ayrı fərdlər və onların məcmusu, ayrı-ayrı ev təsərrüfatları/ailələr və onların məcmusudur (Bratenkova, 2014: 34).

Bazar sferasında analitik fəaliyyətin iki pilləsi var: birinci – faktların şərhi, bazarın və firmanın özünün vəziyyəti və nəzərdən keçirının qiymətləndirilməsi, daha mürəkkəbi isə səbəb-nəticə əlaqələrinin izahı və modelləşdirilməsi, bazar və bazar münasibətlərinin gələcək inkişafının elmi proqnozaşdırılmasıdır. Bunula əlaqədar olaraq, marketinq təhlilinin müxtəlif tipləri nəzərdən keçirilir (bax, şəkil 1.1).

Marketinq təhlilində mütləq bir tələb vardır: onun nəticələri dəqiq olmalı və ikimənalı olmamalı, mütləq qaydada praktiki tövsiyələrlə müşayiət olunmalıdır.

Analitik tədqiqatın nəticələri aşağıdakı şəkildə tərtib olunur: keyfiyyət qiymətləndirmələri, kəmiyyət xüsusiyyətləri, sxem və diaqramlar, statistik və iqtisadi modellər (Bergis, 2008: 28).

Marketinq təhlilinin əsas məqsədi bazarın vəziyyəti və inkişafının xarakteristikası və proqnozlaşdırılmasıdır. Bu zaan bazarın inkişaf səviyyəsi, onun dinamika və strukturu, ərazi xüsusiyyətləri və qarşılıqlı münasibətləri və s. öyrənilir.

Yuxarıda deyilənlərə əsaslanaraq, bizim marketinq tədqiqatlarında ölkədə ərzaq məhsulları bazarının təhlili aşağıdakı ardıcıllıqla həyata keçirilir:

- ümumi kənd təsərrüfatı istehsalının inkişaf dinamikası;
- bütün kateqoriyalar, kənd təsərrüfatı müəssisələri və fərdi fəaliyyətlər daxil olmaqla ümumi kənd təsərrüfatı istehsalının strukturu;
- kənd təsərrüfatı müəssisələrinin, fərdi sahibkarların ev təsərrüfatlarının sayı;
- adambaşına düşən əsas ərzaq məhsulları istehsalının dinamikası;
- kənd təsərrüfatı müəssisələrində istehsal olunan 1 sentner ərzaq məhsulunun dəyəri;
- 1 sentner məhsul istehsalına çəkilən xərclərin, adam/saatların dinamikası;
- qida məhsullarının pərakəndə ticarətinin inkişaf dinamikası;
- topdansatış ticarətin inkişaf dinamikası.

Daha sonra yuxarıda qeyd olunan ardıcıllıqla ölkədə ərzaq məhsullarının marketinq təhlili prosesinə keçid almışıq.

Son illərdə ölkədə kənd təsərrüfatı istehsalının kəskin şəkildə artdığı vurğulanmalıdır (bax, cədvəl. 1.2). Yalnız 2010-2018-ci illər üçün bütün kateqoriyalar üzrə kənd təsərrüfatı məhsulları 3,9 milyard manatdan 7,0 milyard manata (137.4%), o cümlədən bitkiçilik məhsulları 2,0 milyard manatdan 3,2 milyard manata (141,1%) və heyvandarlıq üçün 1.9 milyard manatdan 3,8 milyard manata (134,0%) qədər artmışdır.

**Cədvəl № 1.2.**
**Kənd təsərrüfatınınümumi məhsulu, faktiki qiymətlərlə və indekslər (2010)**
**(Azərbaycanın kənd təsərrüfatı, 2019: 57)**

| **Illər** | **Cəmi** | | **o cümlədən** | | | |
|---|---|---|---|---|---|---|
| | | | **bitkiçilik məhsulları** | | **heyvandarlıq məhsulları** | |
| Bütün təsərrüfat kateqoriyaları | | | | | | |
| 2010 | 3 877,7 | - | 1999,2 | - | 1 878,5 | - |
| 2011 | 4 525,2 | 105,8 | 2 339,8 | 108,0 | 2 185,4 | 103,5 |
| 2012 | 4 844,6 | 112,8 | 2 458.2 | 114,3 | 2 386,4 | 111,4 |
| 2013 | 5 244,6 | 118,3 | 2 629,6 | 119,1 | 2 615,0 | 117,5 |
| 2014 | 5 225,8 | 115,2 | 2 449,4 | 109,2 | 2 776,4 | 121,0 |
| 2015 | 5 635,3 | 122,8 | 2 761,1 | 121,5 | 2 874,2 | 124,0 |
| 2016 | 5 632,4 | 126,0 | 2 577,2 | 124,6 | 3 055,2 | 127,5 |
| 2017 | 6 580,0 | 131,8 | 3 019,0 | 132,2 | 3 561.0 | 131,0 |
| 2018 | 7 010,0 | 137,4 | 3 186,0 | 141,1 | 3 824,0 | 134,0 |
| Kənd təsərrüfatı müəssisələri | | | | | | |
| 2010 | 192.6 | - | 60,0 | - | 132,6 | - |
| 2011 | 236,0 | 109.9 | 82,2 | 118.0 | 153,8 | 106,0 |
| 2012 | 319,4 | 155.9 | 97,3 | 142.8 | 222,1 | 162,3 |
| 2013 | 363,9 | 186.8 | 120 5 | 174.2 | 243,4 | 193,0 |
| 2014 | 404,5 | 209.2 | 111,8 | 171.1 | 292,7 | 229,4 |
| 2015 | 410,1 | 215.7 | 132,5 | 20[1, s. 88-89]..4 | 277,6 | 222,3 |
| 2016 | 449,2 | 224.6 | 145,8 | 244.3 | 303,4 | 215,2 |
| 2017 | 645,4 | 257.4 | 238,5 | 284.8 | 406,9 | 244,5 |
| 2018 | 660,9 | 266.9 | 262, 1 | 343.8 | 398,8 | 229,1 |
| Fərdi sahibkar, ailə kəndli və ev təsərrüfatları | | | | | | |
| 2010 | 3 685,1 | - | 1 939,2 | - | 1 745,9 | - |
| 2011 | 4 289,2 | 105.6 | 2 257.6 | 107,7 | 2 031,6 | 103,4 |
| 2012 | 4 525,2 | 110.6 | 2 360,9 | 113,3 | 2 164,3 | 107,6 |
| 2013 | 4 880,7 | 114.8 | 2 509,1 | 117,2 | 2 371,6 | 112,2 |
| 2014 | 4 821.3 | 110.5 | 2 337.6 | 107,1 | 2 483,7 | 113,7 |
| 2015 | 5 225,2 | 118.1 | 2 628,6 | 118,7 | 2 596,6 | 117,4 |
| 2016 | 5 183,2 | 121.4 | 2 431,4 | 120,6 | 2 751,8 | 121,4 |
| 2017 | 5 934,6 | 125.1 | 2 780,5 | 127,2 | 3 154.1 | 123,2 |
| 2018 | 6349,1 | 131.0 | 2923,9 | 134,3 | 3 425.2 | 128,0 |

Bənzər tendensiya kənd təsərrüfatı məhsulları istehsalı ilə məşğul olan kənd təsərrüfatı müəssisələri və fərdi sahibkarlar üzrə də müşahidə olunur.

Xüsusilə, kənd təsərrüfatı müəssisələri üçün bu göstərici bütövlükdə 192,6 milyon manatdan 660,9 milyon manata (266,9%), o cümlədən bitkiçilik üzrə 60,0 milyon manatdan 262,1 milyon manat (343,8%); mal-qara - 132,6 milyon manatdan 398,8 milyon manata (229,1%) artım qeydə alınmışdır (Agafonov, 2017: 120).

Fərdi sahibkarlara gəldikdə isə, bu göstəricilər, müvafiq olaraq, 3685.1 və 6349,1 (131,6%); 1939,2 və 2923,9 (134,3%); 1745,9 və 3425,2 (128,0%) (Bozhuk, 2017: 42).

Tədqiq olunan dövrdə həm kənd təsərrüfatı müəssisələrində, həm də fərdi sahibkarlıqda ərzaq məhsullarının tərkibi dəyişmişdir (cədvəl 2.2). Belə ki, 2010-2018-ci illər üçünməhsul istehsalında kənd təsərrüfatı müəssisələrinin payı 5,0% -dən 9,4% -ə, o cümlədən bitkiçilikdə 3,0% -dən 8,2% -ə,heyvandarlıq sahəsində isə 7,3% -dən 10,4% -ə qədər yüksəlmişdir.

Eyni zamanda, fərdi sahibkarlıq fəaliyyətinin bu göstəricisi bir qədər azalmışdır: 95,0% -dən 90,6% -ə; 97,0% -dən 91,8% -ə qədər; 92,9% -dən 89,6% -ə qədər.

**Cədvəl № 1.3.**

**A. Kənd təsərrüfatının ümumi məhsulunun strukturu, faktiki qiymətlərlə, yekuna görə faizlə (Azərbaycanın kənd təsərrüfatı, 2019: 62) təsərrüfat kateqoriyaları üzrə**

| İllər | Cəmi | o cümlədən | |
|---|---|---|---|
| | | bitkiçilik məhsulları | heyvandarlıq məhsulları |
| Kənd təsərrüfatı müəssisələri | | | |
| 2010 | 5,0 | 3,0 | 7,1 |
| 2011 | 5,2 | 3,5 | 7,0 |
| 2012 | 6,6 | 4,0 | 9,3 |
| 2013 | 6,9 | 4.6 | 9,3 |
| 2014 | 7,7 | 4,6 | 10,5 |
| 2015 | 7,3 | 4,8 | 9,7 |
| 2016 | 8,0 | 5,7 | 9,9 |
| 2017 | 9,8 | 7,9 | 11,4 |
| 2018 | 9,4 | 8,2 | 10,4 |
| Fərdi sahibkar, ailə kəndli və ev təsərrüfatları | | | |
| 2010 | 95,0 | 97,0 | 92,9 |
| 2011 | 94.8 | 96,5 | 93,0 |
| 2012 | 93,4 | 96,0 | 90,7 |
| 2013 | 93.1 | 95,4 | 90,7 |
| 2014 | 92.3 | 95,4 | 89,5 |
| 2015 | 92,7 | 95,2 | 90,3 |
| 2016 | 92,0 | 94,3 | 90,1 |
| 2017 | 90,2 | 92,1 | 88,6 |
| 2018 | 90.6 | 91,8 | 89,6 |

Kənd təsərrüfatı məhsullarının daxili strukturunda da dəyişiklik baş vermişdir (Axundov, 2005: 153). Xüsusilə, 2010-2018-ci illəri üçün bütün məhsul kateqoriyası üzrə bitkiçilik sahəsində 51,6%-dən 45,4% -ə, heyvandarlıqda isə 48,4%-dən 54,6%-ə qədər azalma müşahidə olunmuşdur.

Müvafiq olaraq, kənd təsərrüfatı müəssisələri üçün bu göstəricilər: 31,2% və 39,7%, 68,8% və 60,3%, fərdi sahibkarlıq fəaliyyəti üzrə isə 52,6% və 46,1%; 47,4% və 53,9%.

**Cədvəl № 1.4.**

**B. Kənd təsərrüfat kateqoriyaları üzrə (Azərbaycanın kənd təsərrüfatı, 2019: 63)**

| İllər | Cəmi | o cümlədən | |
|---|---|---|---|
| | | bitkiçilik məhsulları | heyvandarlıq məhsulları |
| Bütün kənd təsərrüfat kateqoriyaları | | | |
| 2010 | 100 | 51,6 | 48,4 |
| 2011 | 100 | 51,7 | 48.3 |
| 2012 | 100 | 50,7 | 49,3 |
| 2013 | 100 | 50,1 | 49,9 |
| 2014 | 100 | 46,9 | 53,1 |

| | | | |
|---|---|---|---|
| 2015 | 100 | 49,0 | 51,0 |
| 2016 | 100 | 45,8 | 54,2 |
| 2017 | 100 | 45,9 | 54,1 |
| 2018 | 100 | 45,4 | 54,6 |
| Kənd təsərrüfatı müəssisələri | | | |
| 2010 | 100 | 31,2 | 68,8 |
| 2011 | 100 | 34,8 | 65,2 |
| 2012 | 100 | 30,5 | 69,5 |
| 2013 | 100 | 33,1 | 66,9 |
| 2014 | 100 | 27,6 | 72,4 |
| 2015 | 100 | 32,3 | 67,7 |
| 2016 | 100 | 32,5 | 67.5 |
| 2017 | 100 | 37,0 | 63,0 |
| 2018 | 100 | 39,7 | 60,3 |
| Fərdi sahibkar, ailə kəndli və ev təsərrüfatları | | | |
| 2010 | 100 | 52,6 | 47,4 |
| 2011 | 100 | 52,6 | 47,4 |
| 2012 | 100 | 52,2 | 47,8 |
| 2013 | 100 | 51,4 | 48,6 |
| 2014 | 100 | 48,5 | 51,5 |
| 2015 | 100 | 50,3 | 49,7 |
| 2016 | 100 | 46,9 | 53,1 |
| 2017 | 100 | 46,9 | 53,1 |
| 2018 | 100 | 46,1 | 53,9 |

Kənd təsərrüfatı məhsullarının daxili strukturunda da dəyişiklik baş vermişdir. Xüsusilə, 2010-2018-ci illəri üçün bütün məhsul kateqoriyası üzrə bitkiçilik sahəsində 51,6%-dən 45,4%-ə, heyvandarlıqda isə 48,4%-dən 54,6%-ə qədər azalma müşahidə olunmuşdur (Azərbaycanın ərzaq balansları, 2019: 70). Ərzaq məhsullarının marketinq təhlilinin yekunu olaraq, pərakəndə və topdan ticarət dövriyyəsinin dinamikasını nəzərdən keçirək (bax, cədvəl 1.5). Təkcə 2014-2018-ci illər ərzində ölkədə pərakəndə ticarət dövriyyəsi 32,0 milyard manatdan 37,1 milyard manata, o cümlədən ərzaq məhsulları üzrə 11,0 milyard manatdan 18,6 milyard manata qədər artmışdır (Azərbaycanın kənd təsərrüfatı, 2019: 644).

Topdan ticarətdə də 25,1 milyard manatdan 31,6 milyard manata qədər artım qeydə alınmışdır.

**Cədvəl № 1.5**
**Pərakəndə və topdansatış ticarət dövriyyəsi haqqında, mlyn.mana (Azərbaycanda ticarət, 2019: 29).**

| | **2014** | **2015** | **2016** | **2017** | **2018** |
|---|---|---|---|---|---|
| **Pərakəndə ticarət dövriyyəsi** | **22001,7** | **25721,1** | **30190,3** | **35268,1** | **37090,0** |
| o cümlədən: | | | | | |
| ərzaq məhsulları, içkilər vətütün məmulatları | 11 023,2 | 12 871,2 | 15 077,4 | 17 883,4 | 18 638,4 |
| alkoqollu içkilər | 261,7 | 306,2 | 311,8 | 337.4 | 361,7 |
| qeyri-ərzaq məhsulları | 10 978.5 | 12 849,9 | 15 112,9 | 17 384.7 | 18 451,6 |
| Ondan: | | | | | |
| avtomobil benzini | 1 235,8 | 1392,2 | 1397,2 | 1 609,1 | 1799,5 |
| **Topdansatış ticarət dövriyyəsi** | **25.132,6** | **26 351,4** | **27 529,1** | **3.1 024,8** | **31 562,6** |
| o cümlədən: | | | | | |

| | | | | | |
|---|---|---|---|---|---|
| müəssisələr | 9 507.4 | 9 520,5 | 9670,3 | 7 894,7 | 9 466,9 |

Beləliklə, qeyd etmək olar ki, respublikadakı bazar vəziyyəti üstünlük təşkil edən bazar şərtlərini (konyunkturanı) müəyyənləşdirir. Qeyd edilməlidir ki, bazar vəziyyəti və bazar konyunkturası anlayışları, demək olar ki, adekvatdır. Bazar konyunkturası bazar vəziyyətidir, müəyyən bir an və ya müəyyən bir dövrdə üstünlük təşkil edən tələb və təklifin nisbətidir. Əmtəə bazarındakı vəziyyət əhəmiyyətli dərəcədə digər bazarlardakı vəziyyətdən asılıdır. Buna görə də, əmtəə bazarının hərtərəfli öyrənilməsi qiymətli kağızlar bazarının, xidmətlər bazarının, investisiya bazarının, əmlak bazarının, əmək bazarının və s. qiymətləndirilməsi ilə əlaqəli olmalıdır (Aleksunin, 2018: 98). Məhsul bazarındakı bir çox proses digər bazarlardakı vəziyyətlə izah olunur və ya müəyyən edilir.

Tədqiqatlar göstərdi ki, bazar prosesinin dinamikası və dalğalanmalarının təhlili marketinq fəaliyyətinin həyata keçirilməsi və kommersiya qərarı verməsi üçün zəruri şərtdir. Bazar qeyri-sabitdir, bu isə bazar şərtlərinin gözlənilmədən və müxtəlif səbəblərin təsiri altında dəyişə biləcəyi anlamına gəlir. Bazar tarazlığı hətta şayiələr kimi əhəmiyyətsiz amillərin təsiri altında belə dəyişikliklərə uğrayır. Marketinqin idarə edilməsi prosesində buna diqqət yetirilməlidir. Bazar şəraitinin təhlili bazarın bütün dinamik qanunauyğunluqlarını və meyllərini, inkişafının mütənasibliyini, sabitlik dərəcəsini (və ya əksinə, dalğalanmaları) əks etdirməlidir (Bachilo, 2017: 75). Bazarın dinamikasının təhlilinin bir variantı da onun təkrarlanmasının və ya dövri proseslərin öyrənilməsidir.

Bazarın ən mühüm xüsusiyyəti dəyişmək, yenilənmək, böyümək/ixtisar olunmaq və ya sabit qalmaq qabiliyyətidir. Bu hadisə dinamiklik kimi tanınır. Bazar parametrlərinin dəyişikliklərinin təhlili və qiymətləndirilməsi, onun inkişaf tendenisyalarının, genişlənmə perspektivlərinin və ya ixtisar olunmaq zərurətinin aşkar edilməsi konyunktur təhlilinə ən mühüm vəzifələrindəndir (Azərbaycanda ticarət, 2019: 184).

## Nəticə

Bazarın məkan təhlili onun miqyası (onun iştirakçılarınım sayı, sazişlərin həcmi, bazarın dövriyyəsi) və strukturu ilə müəyyən olunur. Bazarın strukturu - konyunkturanın əsas keyfiyyət göstəricilərindən biridir. O, bazarın əsas proporsiyalarını, xüsusi halda isə onun əmtəə strukturunu əks etdirir.

Bazarın tərəddüdləri əhəmiyyətli dərəcədə onun müəyyən hədlərdə marketinqlə məhdudlaşan təbiiliyinin təzahürü kimi çıxış edir. Hesab olunur ki, o, bazar mexanizminin əsasında durur. Parametrlər həm təsadüfi məruz qalır, həm də dövri və mövsümi tərəddüdlərə məruz qalır.

## Ədəbiyyat

1. Azərbaycanın kənd təsərrüfatı müəssisələrin və fərdi sahibkar təsərrüfatlarının əsas iqtisadi göstəriciləri. (2019). AR DSK. Bakı, 316 s.
2. Belyavskiy, I.K. (2004). Marketingovoye issledovaniye. M.: MGUESI, 414 s.
3. Bratenkova, T.M. (2014). Marketing otrasli. Minsk: BGTU, 52 p.
4. Bergis, T.A. (2008). Metodika provedeniyamarketingovykh issledovaniy. Tol'yatti: TGU, 48 s.
5. Agafonov, A. (2017). Setevoy marketing. M.: Omega-P, 154 p.
6. Bozhuk, S. (2017). Marketingovyye issledovaniya. M.: Yurayt, 280 s.
7. Axundov, Ş.Ə. (2005). Marketinqin əsasları. Bakı: ADİU, 632 s.
8. Azərbaycanın ərzaq balansları. (2019). AR DSK. Bakı, 94 s.
9. Azərbaycanın kənd təsərrüfatı. (2019). AR DSK. Bakı, 644 s.
10. Aleksunin, V.A. (2018). Marketingovyye kommunikatsyy. M.: Dashkov i K, 196 s.
11. Bachilo, S.V. (2017). Direkt-marketing. M.: Dashkov i K, 212 p.
12. Azərbaycanda ticarət. (2019). AR DSK. Bakı, 184 s.

Göndərilib: 20.08.2023 Qəbul edilib: 30.09.2023

DOI: https://doi.org/10.36719/2663-4619/95/48-53

**Aynur Məmmədova**
Azərbaycan Dövlət Aqrar Universiteti
mehribanks@mail.ru

# KƏND TƏSƏRRÜFATINDA İNNOVASİYA YÖNÜMLÜ İNVESTİSİYA QOYULUŞLARININ MALİYYƏ MƏNBƏLƏRİ

**Xülasə**

Kənd təsərrüfarında innovasiya fəaliyyəti yüksək dərəcədə qeyri-müəyyənliyi və riskli olması ilə fərqlənir. Bu səbəbdən kənd təsərrüfatında innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsi investorlar üçün cəlbedici deyil və həmin investisiyaların maliyyə mənbələrinin axtarıb tapılması çox mürəkkəb məsələdir. Tədqiqat apardığımız mövzunun aktuallığı da elə bununla şərtlənir. Məqalədə kənd təsərrüfatında innovasiya yönümlü investisiya qoyuluşlarının maliyyə mənbələri araşdırılmış, müxtəlif mənbələr göstərilmiş və onların üstün cəhətləri və çatışmamazlıqları tədqiq edilmişdir. Kənd təsərrüfatında innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinin təşkili prinsipləri maliyyə mənbələrinin çoxluğuna istiqamətlənməli olmasının zəruriliyi əsaslandırılmışdır. Bunun üçün müxtəlif elmi nəşrlər araşdırılmışdır. Tədqiqatın məqsədi kənd təsərrüfatında innovasiya yönümlü investisiyaların maliyyə mənbələrinin axtarıb tapılması və istifadəsinin əsaslandırılmasıdır. Tədqiqatın gedişində təhlil, müqayisə, statistik tədqiqat metodlarından istifadə edilmişdir.

***Açar sözlər:*** *innovasiya, qeyri-müəyyənlik, risk, rəqabət qabiliyyəti, maliyyə mənbələri, vençur kapitalı*

**Aynur Mammadova**
Azerbaijan State Agrarian University
mehribanks@mail.ru

## Financial sources of innovation-oriented investments in agriculture

**Abstract**

Innovation activity in agriculture is characterized by a high degree of uncertainty and risk. For this reason, the financing of innovation-oriented investments in agriculture is not attractive for investors, and finding sources of financing for those investments is a very complicated issue. The relevance of the subject we are researching is conditioned by this. In the article, the financial sources of innovation-oriented investments in agriculture were investigated, various sources were indicated and their advantages and disadvantages were studied. The principles of organizing the financing of innovation-oriented investments in agriculture are based on the need to focus on the majority of financial sources. Various scientific publications were examined for this. The purpose of the study is to find and justify the use of financial sources of innovation-oriented investments in agriculture. In the course of the research, analysis, comparison, and statistical research methods were used.

***Keywords:*** *innovation, uncertainty, risk, competitiveness skills, financial sources, venture capitals*

## Giriş

Ölkə iqtisadiyyatının aparıcı sahələrindən biri olan aqrar sahənin inkişaf etdirilməsinin çox mühüm əhəmiyyəti var. Əhalinin rifah səviyyəsi, ərzaqla təminatı, xüsusilə kənd əhalisinin işlə təmin olunması, emal sənayesinin xammalla təminatı birbaşa kənd təsərrüfatından asılı olduğu üçün hər bir dövlət bu sahənin inkişaf etdirilməsində maraqlıdır (Mustafayeva, Hətəmov, Həsənova, Süleymanov, 2022: 304).

Müasir şəraitdə innovativ fəaliyyət kənd təsərrüfatının inkişafında başlıca amildir, ölkəmizdə bundan maksimum istifadə aqrar sahənin dayanıqlı inkişafını təmin edəcəkdir (Babayeva, 2020: 34). Yalnız innovativ inkişafını ləngidən amillər vardır. Bunlardan əsası yüksək texnologiyaların tədbiqi əsasında kənd təsərrüfatı istehsalını tam miqyaslı modernləşdirmək üçün zəruri həcmdə investisiya resurslarının olmamasıdır. İnnovativ inkişafın investisiya təminatı problemi sahədə investisiya fəaliyyətinin fəallaşması ilə bağlıdır. Bununla bağlı Azərbaycanın aqrar sahəsinin innovativ inkişafının təmin edilməsinin əsas şərti innovasiya yönümlü investisiyaların maliyyə mənbələrinin axtarıb taöılması və düzgün seçilməsidir.

Aqrar sahənin innovativ inkişafı dedikdə aqrar istehsalda yeni təfəkkürün formalaşdırılması və tədbiqindən ibarət innovasiya fəaliyyətinin fasiləsiz həyata keçirilməsi başa düşülür (Sayganov, Chabatul, 2019: 112-120).

Yeni məhsul və ya əməliyyat (texnologiya, proses) kapital qoyuluşlarının bazarda reallaşdırılmasının nəticəsidir. Buna görə də müxtəlif yeniliklərin çox olduğu bir zamanda onların hər hansı bir iş təcrübəsində reallaşdırılması üçün vacib şərt kifayət qədər investisiyaların cəlb edilməsidir. Bunun üçün iqtisadiyyatın bütövlükdə, o cümlədən də kənd təsərrüfatı sahəsinin uzunmüddətli, yüksək və dayanıqlı artımını qoruyub saxlamaq, bazarda rəqabətqabiliyyətli məhsulun xüsusi çəkisinin arırılması şərtdir. Kənd təsərrüfatının investisiya-innovativ inkişafının səviyyəsi əsas vəsaitlərin olmasından və vəziyyətindən, habelə onların yenilənməsinin sürətindən əhəmiyyətli dərəcədə asılıdır. Bu isə investisiya qoyuluşları vasitəsiylə həyata keçirilir.

Maliyyə vəziyyətləri mürəkkəb olduğu üçün yerli kənd təsərrüfatı məhsul istehsalçıları innovasiya yönümlü investisiyaları istədikləri həcmdə və ölçüdə maliyyələşdirməkdə çətinlik çəkirlər. Nəticədə kənd təsərrüfatında innovasiya işləmələrinin və texnologiyaları tədbiqi səviyyəsi çox aşağı olaraq qalır, dünya liderləri ilə müqayisədə texniki-texnoloji geriddəqalma davam edir. Kənd təsərrüfatı sahəsi aşağıgəlirli olduğu üçün digər sahələrlə müqayisədə investisiya baxımından daha az çəlbedicidir. Bu kənd təsərrüfatının innovativ inkişafının investisiya təminatının müasir mənbələrinin və formalarının axtarıb tapılmasını və ya işlənib hazırlanmasını zəruri edir. Maliyyə vəsaitlərinin çatışmaması problemini həll etmək üçün innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsi mənbələrini araşdırmaq və ən əlverişlisini seçmək lazımdır.

Dünya təcrübəsi göstərir ki, innovatuv inkişafın sürətləndirilməsi prosesi yalnız vahid maliyyələşdirmə mənbəyi hesabına təmin oluna bilməz. Burada maliyyələşdirmə sistemi dedikdə maliyyə münasibətləri və mexanizmləri vasitəsiylə qarşılıqlı əlaqədə olan innovasiya fəaliyyətində iştirak edən subyektlərin və institutların məcmusu başa düşülür. Maliyyələşdirmə mexanizmi – innovasiyaların yaradılması və tədbiq edilməsi üçün zəruri olan maliyyə resurslarının dəyişdirilməsi və yenidənbölgüsü vasitəsiylə innovasiya layihələrinin maliyyə təminatına yönəlmiş maliyyə üsulları və alətləri sistemidir (Chukin, 2020: 124-124).

Apardığımız tədqiqat nəticəsində aşkar edilmişdir ki, ölkədə tədqiqat və işləmələrə çəkilən ümumi xərclər 2019-cu ildə 171, 1 milyon manat, 2021-ci ildə isə 201,2 milyon mant olmuşdur. Artım 18% olmuşdur. Tədqiqat və işləmələrə çəkilən ümimi xərclərin içində 2019-cu ildə 95,8 %, 2021-ci ildə 96,5 % tədqiqat daxili xərclər olmuşdur, xarici xərclər müvafiq olaraq 4,2% və 3,5% olmuşdur. Tədqiqat və işləmələrə çəkilən daxili xərclərin tərkibində əsaslı xərclər 2019-cu ildə 1,5%, 2021-ci ildə 1% təşkil etmişdir (5).

İnnovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinin aşağıdakı mənbələri mövcuddur: daxili və xarici. Kənd təsərrüfatında innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinə çəkilən xərclərin daxili mənbələrinə kənd təsərrüfatı müəssisələrinin öz vəsaitləri aiddir. Kənd təsərrüfatı müəssisələrinin innovasiya yönümlü investisiyalarının öz vəsaitləri hesabına maliyyələşdirilməsinin bir neçə variantı vardır. Daxili mənbələrdən biri müəssisələrin bölüşdürülməmiş mənfəətidir. Bölüşdürülməmiş mənfəət müəssisənin xalis mənfəətdən tsisçiləri ilə hesablaşdıqdan sonra qalan mənfəətdir. Lakin kənd təsərrüfatı müəssisələrinin əksəriyyətində bunun üçün kifayət qədər mənfəəti yoxdur. Digər mənbə ismində müəssisənin aktivləri ola bilər. Bir layihənin maliyyələşdirilməsi üçün nəzərdə tutulan aktivlər sinerji prinsipi üzrə innovasiya yönümlü investisiyaların da maliyyələşdirilməsinə istifadə oluna bilər. Debitor borclarının azaldılması bu

qəbildən olan mənbələrdən sonuncusudur. Adətən müəssisələrin daxili vəsaitləri öz ETTKİ-nin, texnologiyaların alınmasının, istehsalatın təşkilinin maliyyələşdirilməsi üçün istifadə edilir. Innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsində müəssisələrin öz vəsaitlərinin istifadəsinin xüsusi çəkisinin yüksək olması ondan xəbər verir ki, innovasiyaların çoxu baza innovasiyalar deyil, əsasən mövcud olan texnologiyaları yeniləşdirən və ya bazarda dövr edən əmtəə və xidmətlərin yaxşılaşdırılmış variantlarıdır. Bundan başqa bu ölkədə innovativ inkişaf üçün maliyyələşdirmə mənbələrinin genişləndirilməsi potensialın olmasından xəbər verir.

Bütövlükdə istənilən şirkət innovasiya yönümlü investisiyaları maliyyələşdirmək üçün öz vəsaitlərini səfərbər edə bilər. Lakin hətta böyük şirkətlər üçün belə miqyaslı innovasiya yönümlü investisiyaları maliyyələşdirmək kifayət qədər mürəkkəb və risklidir. Bu səbəbdən də innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsini əsas mənbələri xarici mənbələrdir. Istehsal prosesini radikal şəkildə dəyişən ən yeni innovasiya texnologiyalarının inkişaf etdirilməsi müxtəlif investorların maliyyə dəstəyi olmadan mümkün deyil. Yəni bunun üçün xarici maliyyə mənbvələrindən istifadə etməyə ehtiyac var.

Kənd təsərrüfatında innovasiya yönümlü investisiyaların maliyyəlışdirilməsinin xarici mənbələrindən biri dövlət maliyyələşdirməsidir. Müxtəlif innovasiya fəaliyyəti formalarının maliyyələşdirilməsinin vacib mənbələrindən biri mərkəzləşdirilmiş vəsaitlərdir (Alekseyeva, 2013: 45-48). Müxtəlif səviyyədə dövlət büdcəsi vasitələri hesabına dövlət üçün prioritet olan sahələrdə innovasiya fəsliyyəti maliyyələşdirilir. Azərbaycanda kənd təsərrüfatı belə sahələrdən biridir. Büdcə vəsaitlərinin təqdim edilməsi aşağıdakı formalarda həyata keçirilir: dövlətin məqsədli innovasiya proqramlarının maliyyətləşdirilməsi; müsabiqə əsasında müəyyən olunmuş perspektivli innovasiya layihələrinəin maliyyələşdirilməsi. Bu zaman müsabiqədə iştirak etmək hüququna iqtisadiyyatın prioritetli olan sahələrinin inkişafına yönəlmiş innovasiya layihələri malik olurlar, onların ödəmə müddəti iki ildən çox olmamalıdır və onlar dövlət idarələri və ya müstəqil şirkətlər aparan ekspertizadan keçib müsbət rəy almalıdırlar.

Bizim ölkədə kənd təsərrüfatında fəaliyyət göstərən istehsalçılar istifadə etdikləri müasir istehsal vasitələrinin idxalını təşfiq etmək üçün gömrük güzəştləri tədbiq olunur və aqrar kredit və inkişaf Agentliyi tərəfindən lizinq yolu ilə kəndlilərə satılan kənd təsərrüfatı texnikasını və avadanlığının dəyərinin 40% büdcədən ödənilir.

Tədqiqatın gedişində xarici ölkələrin aqrar sahədə innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinə və stimullaşdırılmasına dair təcrübəsi öyrənilmişdir. Burada dövlət tərəfindən həyata keçirilən əsas stimullaşdırma tədbirlərinə güzəştli vergiqoyma, amortizasiya siyasəti, yeni məhsul növlərini mənimsəyən müəssisələrə büdcədən verilən birbaşa dotasiyalar aid ol bilər. Vergi tədbirləri ABŞ, Kanada və Avstriyada güclü stimullaşdırıcı effektə malikdir. Bu ölkələrdə ETTK işlərinin qiymətinin azalması onlara çəkilən xərclərin artması ilə müşayət olunur. Belə ki, ABŞ-da vergiyə cəlb olunmayan mənfəətin 40-60% ETTKİ sahəsinə istehsalın yenilənməsinə yönəldilir (Sigarev, Narynbayeva, 2015: 156-160).

Innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinin digər növü səhmdar maliyyəsi. Perspektivli innovasiya layihələrini həyata keçirmək üçün səhmlərini çox sayda investorlar arasında yerləşdirərək böyük maliyyə resurslarını akkumulyasiya etməyə imkan verən bu cür maliyyələşdirmə forması açıq və ya qapalı səhmdar cəmiyyəti formasında təşkil olunmuş kənd təsərrüfatı müəssisəlıərində mümkündür. Azərbaycanda kənd əsərrüfatı sahəsində bu formada müəssisələr mövcuddur. Qiymətli kağızların emissiyası vasitəsiylə investisiya krediti bazara məxsus borc öhdəlikləri ilə əvəz edilir. Bu da innovasiya layihələrinə qoyulan maliyyə resurslarının strukturunu optimallaşdırmağa imkan.

Maliyyələşdirmə mənbələrindən digəri borc vəsaitləridir. Bank kreditləri bunların əldə edilməsinin əsas yoludur. Bank kreditləri kənd təsərrüfatında innovasiya yönümlü investisiyaların bütün mərhələlərdə maliyyələşdirilməsinin ən vacib yollarından biridir. Bankların potensial investorları kreditləşdirmək üçün əhəmiyyətli potensialı vardır. Qərbdə vençur forndlarının əsas investorları onlardır çünki, onlar həm innovasiya fəaliyyətinin iştirakçılarını maliyyə resurslarına olan tələbatlarını təmin edirlər, həmdə innovasiya yönümlü investisiyalar bazarının iştirakçılarının

maraqlarını birləşdirə bilir. 2021-ci ildə Azərbaycanın kənd təsərrüfatında fəaliyyət göstərən hüquqi şəxslərə 563,2 milyon manat məbləğində kredit verilmişdir. Bu isə 2020-ci ildə verilən kreditdən 6 % çoxdur. Bu ölkədə bankların həmin ildə etdikləri kredit qoyuluşlarının (17119,8 milyon manat) 3,3%-dir. Müqayisə üçün qeyd edək ki, ticarət və xidmət sektoruna 2982,3 milyon manat, ev təsərrüfatlarına 8320, 5 milyon manat kredit verilmişdir. Ölkə iqtisadiyyatına yatırılan investisiyaların isə 2019-cu ildə 4,2%, 2021-ci ildə - 2% kənd təsərrüfatına yatırılmışdır. Araşdırmalar göstərdi ki, 2019-cu ildə tədqiqat və işləmələrə çəkilən daxili xərclərin 74%, 2021-ci ildə 79% büdcə, 7,4% və 5,9% isə öz vəsaitləri hesabına olmuşdur (5).

Kənd təsərrüfatında innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsində bank sektorunun fəaliyyətinin zəif olması onunla izah olunur ki, investisiya dövrü qısadır, innovasiya layihələrinə edilən investisiyaların risklik səviyyəsi isə yüksəkdir. Kənd təsərrüfatında innovasiya yönümlü layihələri maliyyələşdirən investorun isə uzunmüddətli bank kreditlərinə ehtiyacı var çünki, o investisiyadan gəlir yalnız innovasiya məhsulu bazara çıxarıldıqdan sonra götürəcəkdir. Maliyyə vəsaitlərinə isə ən çox onun tələbatı innovasiyaların ilkin mərhələsindədir. Çünki, bu mərhələdə istehsalçı dövriyyə vəsaitlərini artırmalı və dövriyyədən kənar aktivlərini formalaşdırmalıdır. İnnovasiya fəaliyyətinin kreditləşdirilməsi adətən biznes təzə-təzə başlayanda edilir.

Bu zaman borc alanın kredit faizlərini vermək üçün kifayət edəcək pul axınları olmur. Bundan başqa yüksək riskli uzunmüddətli kredit qoyuluşları etmək üçün banklar müəyyən şərtlərin yerinə yetirilməsini tələb edirlər.

Məsələn, qərb ölkələrində bank kreditləri almaq üçün borcalan müəsisənin səhmlərinin nəzarət paketinin girov qoyulması sxemindən istifadə edilir.

Kənd təsərrüfatı sahəsində innovasiya yönümlü investisiyaları maliyyələşdirmək üçün vençur maliyyələşdirməsindən də istifadə olunur. Vençur maliyyələşdirilməsi təsərrüfatçılıq subyektinə tələb olunan vəsaitləri onun nizamnamə kapitalına vəsait qoymaq və bağlı kredit təqdim etmək yolu ilə həyata keçirilir. Bunun müqabilində vençur investoru nizamnamə kapitalında sözləşdikləri payı alır və onu satıb ona çatacaq mənfəəti əldə edənədək özündə saxlayır. Vençur kapitalının iki sektoru vardır: formal (investorların resurslarını birləşdirən fondlar) və qeyri-formal (biznes-mələklər) (Ignatov, 2016: 379-383).

İnnovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinin yeni formalarından biri də kraudvestinqdir. Kraudvestinq vəsaitlərin toplanmasının öz vəsaitlərini onları maraqlandıran layihə və ideyalara qoyan hüquqi və fiziki şəxslərin kollektiv əməkdaşlığına əsaslanan bir üsuludur. İdeya və layihənin təşəbbüskarları investisiyaları cəlb etməyə imkan verən xüsusi internet platformaların vasitəsiylə onları geniş auditoriyaya təqdim edə bilərlər (Litvintsev, 2016: 22-26).

Böyük həcmdə maliyyələşdirməni təqdim edə bilən banklardan, vençur təşkilatlarından, biznes-mələklərdən fərqli olaraq kraudvestinq çox sayda özəl investorlardan çox olmayan maliyyə qoyuluşlarının cəlb edilməsini nəzərədə tutur (Panova, 2018: 238-250).

Xarici təcrübə göstərir ki, innovasiya yönümlü investisiyaların vençur maliyyələşdirilməsinin təşkilinin ən səmərəli forması birbaşa investisiya qoyuluşları, iri innovasiya layihələrinin birgə investisiya qoyuluşları, vençur fondunun yaradılmasıdır. Birbaşa invrstisiyalar həm riski artırır, həm də iş uğurlu olarsa mənfəəti artırır. Böyük innovasiya layihələrinin birgə investisiya qoyuluşları iştirakçıların riskini minimallaşdırır, həm də hər bir investorun şəxsi mənfəətini azaldır. Vençur fondları riski çox sayda investorlar arasında bölüşdürür, konkret investorun payının azalması və vençur kapital qoyuluşları üzrə mütəxəssislərin innovasiya layihələrini idarə etmələri hesabına vəsaitlərin etibarlılığını artırır. Vençur fondlarına vəsaitlər təkcə böyük təşkilatlardan deyil, həm də pensiya sığorta fondlarından, sığorta təşkilatlarının sığorta fondlarından, kiçik biznesin dəstəklənməsi və inkişaf etdirilməsi üzrə dövlət və özəl fondlardan daxil ola bilər. İnnovasiya potensialının formalaşdırılmasının, sahibkarların fəallığının artırılmasının və mənfəətin alınmasının ən vacib mənbələrindən biri vençur kapitalıdır. Vençur kapitalının özəl investorları və ya “biznes-mələklər”in iqtisadi əhəmiyyəti vençur şirkətlərinin ilkin mərhələlərdə inkişafının

dəstəklənməsində, səhmdar kapitalının, kredit resurslarının və ya hər ikisinə investisiya qoyuluşlarının maliyyələşdirilməsinin dinamikasında üzə çıxır (Əhmədov, 2010: 484).

İnnovasiyaların dolayısına maliyyələşdirilməsinin bir forması françayzinqdir. Fançayzinq şirkət tərəfindən fiziki və ya hüquqi şəxsə bu şirkətin əmtəə nişanı altında və ya onun texnologiyası ilə əmtəə və xidmətlərin istehsalına və ya satışına lisenziyanın (franşizanın) verilməsidir. Müqavilədə lisenziyanın qüvvədə olduğu müddət, əmtəə və xidmətlərin istehsal və ya satışı həyata keçirilən ərazi, ödəmə formaları göstərilir.

## Nəticə

Kənd təsərrüfatında innovasiya yönümlü investisiyalar çoxlu maliyyə vəsaiti tələb etdiyinə görə, büdcəyə yük olmamaq üçün müxtəlif büdcədənkənar maliyyələşdirmə mənbələrini axtarıb tapmaq tələb olunur. Bu tədqiqatların nəticəsinin kommersiya xarakterli olmasına səbəb olur. Daxili və xarici maliyyələşdirmə mənbəlırinin axtarışı innovasiya yönümlü investisiyaların maliyyələşdirliməsinin zəruri şərtimnə çevrilir.

Qarışıq maliyyələşdirmə innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinə müxtəlif mənbələrdən maliyyə vəsaitlərinin cəlb edilməsi yolu ilə həyata keçirilir. Inkişaf etmiş ölkələrdə innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinə həm dövlət vəsaitləri, həm də özəl mənbələr cəlb olunur. Qərbi Avropa ölkələrinin çoxunda və ABŞ-da ETTKİ-n maliyyələşdirilməsi dövlət və xüsusi kapital arasında təxminən bərabər bölüşdürülür.

İqtisadiyyatın innovasiyalı inkişaf yoluna keçməsi qlobal miqyasda rəqabətqabiliyyətli milli innovasiya sistemi formalaşdırılmadan mümkün deyil. Onun yaradılması üçün isə iqtisadiyyatın innovasiyalara olan tələbini artırmaq lazımdır. İnnovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinin mövcud olan və formalaşdırılan sistemi həm daxili xərclərin maliyyə təminatını lazımi səviyyədə saxlamağa həm də ilkin mərhələlərdən genişlənmə mərhələsinədək innovasiya firmasının inkişafı üçün şərait yaratmalıdır. Bunun üçün də innovasiya fəaliyyətinin maliyyə sistemi çərçivəsində olan maliyyələşdirmə mexanizmi müəyyən prinsiplərə cavab verməlidir (Trifilova, 2013: 5).

Kənd təsərrüfatında innovasiya yönümlü investisiyaların maliyyələşdirilməsinin təşkili prinsipləri maliyyə mənbələrinin çoxluğuna istiqamətlənməlidir və innovasiyaların tez və səmərəli tədbiqini, onların komersiyalaşdırılmasını nəzərdə tutmalıdır ki, innovasiyaların tədbiqinin verimi artsın.

## Ədəbiyyat

1. Mustafayeva, R.R., Hətəmov, A.N., Həsənova, M.H., Süleymanov, F.V. (2022). Aqrar iqtisadiyyat. Ali məktəb tələbələri üçün dərslik. Bakı: Mütərcim, 304 s.
2. Babayeva, V.M. (2020). Aqrar sahənin innovasiyali inkişafinin prioritet istiqamətləri. Agricultural Economics. № 4, 34 s.
3. Sayganov, A.S. (2019). Sovremennoye sostoyaniye i perspektivy razvitiya innovatsionnoy deyatelnosti v pishchevoy promyshlennosti Yevraziyskogo ekonomicheskogo soyuza. Problemy agrorynka (Respublika Kazakhstan). №1, s.112-120.
4. Chukin, F. (2020). Osnovnyye mekhanizmy investirovaniya v innovatsii v selskom khozyaystve. "Ekonomika, trud, upravleniye v selskom khozyaystve". № 8, s.124-128.
5. https://www.stat.gov.az/
6. Alekseyeva, S.A. (2013). Finansovaya podderzhka innovatsiy v selskom khozyaystve Vestnik finansovogo universiteta (2), s.45-48.
7. Sigarev, M.I., Narynbayeva, A.S. (2015). Stimulirovaniye proizvodstva sel'skokhozyaystvennoy produktsii na osnove innovatsionnogo razvitiya: opyt zarubezhnykh stran. Vestn. Altayskogo gos. agrar. un-ta. № 9, s.156-160.
8. Ignatov, K.S. (2016). Osobennosti venchurnogo finansirovaniya innovatsiy v RF. Molodoy uchenyy. № 21, s.379-383.
9. Litvintsev, I.P. (2016). Innovatsionnyy put razvitiya ekonomiki Rossii kak usloviye dalneyshego ekonomi cheskogo rosta. Ekon. nauki. № 4 (29), s.22-26.

10. Panova, Ye.A. (2018). Kraudfanding, kak al'ternativnyy instrument finansirovaniya malogo i srednego biznesa. Finansy i kredit. T. 24. № 1 (769), s.238-250
11. Əhmədov, G.Ə. (2010). Kənd təsərrüfatında innovasiyaların tətbiqi istiqamətləri. Bakı, 484 s.
12. Trifilova, A.A. (2013). Upravleniye innovatsionnym razvitiyem predpriyatiya. M.: Finansy i kredit, 5 s.

Göndərilib: 20.08.2023 Qəbul edilib: 30.09.2023

DOI: https://doi.org/10.36719/2663-4619/95/54-58

**Səbinə Abbasova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti Ağcabədi filialı
abbasovasebine58@gmail.com

# TƏHSİL SUBYEKTLƏRİNİN İNKLÜZİV TƏHSİLİN TƏTBİQİNƏ TƏŞVİQ OLUNMASINDAKI ROLU

**Xülasə**

İnklüziv təhsil, fərqli ehtiyac və bacarıqlara sahib olan bütün öyrənənlərin eyni mühitdə *təhsil aldığı bir təhsil modelini ifadə edir. Bu məqalə inklüziv təhsilin əhəmiyyətini,* faydalarını və təhsil subyektlərinin fərqli öyrənmə mühitinə dəstəyinin vacibliyini vurğulayır. İnklüziv təhsil tətbiq edilən məktəblərdə təhsil alanlar fərqli arxitekturaya sahib cəmiyyətin bir hissəsi olurlar. Bu, sosial münasibətlərin inkişafına yardım edən bir yanaşmadır. Deməli, inklüziv təhsilin təmin edilməsi təhsil subyektləri, cəmiyyətlər və ümumiləşdirilmiş dünya üçün əhəmiyyətli bir məsələdir. İnklüziv təhsil, insan hüquqlarının və sosial inkişafın təminatçısıdır və böyük bir ictimai fayda təşkil edir.

***Açar sözlər:*** *inkluziv, dəyərlər, təhsil, tolerant, inkişaf*

**Sabina Abbasova**
Aghjabedi branch of Azerbaijan State Pedagogical University
abbasovasebine58@gmail.com

## The role of educational subjects in promoting implementation of inclusive education

**Abstract**

Inclusive education refers to an education model in which all students with different needs and abilities are educated in the same environment. This article emphasizes the importance of inclusive education, its benefits, and the importance of supporting the diverse learning environment of education branches. Those who receive education in schools where inclusive education is applied become a part of the society with a different architecture. This is an approach that helps develop social relations. Therefore, ensuring inclusive education is an important issue for education sub-sections, societies and the generalized world. Inclusive education is a guarantor of human rights and social development and creates a great social benefit.

***Keywords:*** *inclusive, values, education, tolerance, development*

## Giriş

İnsan dünyanın ən inkişaf etmiş canlısıdır. İnsanı kəşf etmək və tanımağa çalışmaq çox ziddiyyətli bir prosesdir. Biz təlim prosesində də müxtəlif dünyagörüşünə, xarakter və əqidəsinə, maraq və meyllərinə, qabiliyyət, istedad və digər xüsusiyyətlərinə görə bir-birindən əsaslı şəkildə fərqlənən insan qruplarının şahidi oluruq. Təhsil insanın öz təcrübələri vasitəsilə davranışında istədiyi istiqamətdə bilərəkdən dəyişiklik yaratmaq prosesidir. Təhsil insanın irsi xüsusiyyətlərini formalaşdıra və öz hüdudları daxilində maksimuma çatdıra bilər (Warner, Lynch, 246). Təhsil sistemləri əvvəlcədən müəyyən edilmiş müəyyən məqsədlərə uyğun fəaliyyət göstərir və bu məqsədlərə nail ola biləcək dərəcədə uğurlu hesab edilir. Təhsil uğurlarının ölçülməsinə bir çox amillər təsir göstərir. Bu amillərdən biri də təhsilin fərdi fərqlərə xidmət etmə dərəcəsidir. Fərdi fərqlərə xidmət edilmədikdə təhsil mühitində ayrıseçkilik davranışı baş verə bilər. Ayrıseçkilik dedikdə bir qrup şəxsin fərdin öz sosial mühitinə uyğunlaşmasına müxtəlif yollarla mane olmağa çalışması göstərilə bilər (Altan, 2019: 27-30). Gündəlik həyatda təcridetmə müxtəlif formalarda özünü göstərir. Daha çox bu münasibətlərə məruz qalanlar isə müxtəlif növ əlliliyi olan şəxslərdir. Ayrıseçkiliyi üzə çıxaran amillər insanın mənsub olduğu sosial-mədəni mühit, cinsi, iqtisadi səviyyəsi, dili, dini, irqi və s. kimi amillər ola bilər. Ayrıseçkiliyin və mənfi münasibətlərin qarşısını

ELMİ İŞ Beynəlxalq elmi jurnal. İmpakt Faktor: 2.255. 2023 / Cild: 17 Sayı: 10 / 54-58 ISSN: 2663-4619
SCIENTIFIC WORK International scientific journal. Impact Factor: 2.255. 2023 / Volume: 17 Issue: 10 / 54-58 e-ISSN: 2708-986X

almaq üçün fərqliliklərə yol verilən məktəblərdə hamı üçün inklüziv təhsil konsepsiyasının hökm sürməsi daimi həll yolu hesab olunur. İnklüziv təhsilin əsas məqsədi müxtəlifliyi əhatə etməklə, təhsildə bərabər imkanlar, sosial ədalət kimi fundamental prinsiplərə əsaslanan, bütün şagirdlər üçün ümumi təhsil proqramını müdafiə edən, təhsil mühitində öyrənənlərin təcrid olunmasının qarşısını almaqdır. Təhsil müəssisələrində inklüziv təhsilin uğurunu şərtləndirən müxtəlif amillər vardır. Bu amillərdən ən mühümü müəllimlərin inklüziv təhsil haqqında bilik səviyyəsi olsa da, Pantic və Florian 2015-ci ildə öz tədqiqatlarında bildirirlər ki, inklüziv təhsil təcrübələrinin uğuru üçün təkcə bilik səviyyəsi kifayət deyil, paralel olaraq müəllimlər inklüziv təhsilə müsbət münasibət və yüksək səviyyəli özünü effektivliyə malik olmalıdırlar (Ainscow, 2002: 12). Müəllimin özünüidarəetmə qabiliyyətinin iki ölçüsü var: Birinci ölçü müəllimin ixtisaslı müəllim xidməti göstərmək üçün tələb olunan davranışları yerinə yetirdiyinə dair inancları və mühakimələridir. Digər ölçü müəllimlərin effektiv tədris metodları vasitəsilə şagird uğurlarını artıra biləcəkləri ilə bağlı inanc və mühakimələridir. Bu kontekstdə yüksək özünəməxsusluq hissi olan müəllimlər daha yaxşı inklüzivliyə malik sinif mühiti yarada bilirlər ("İnsan Hüquqları haqqında Ümumi Bəyannamə", 1948).

İnklüziv təhsil, təhsil sistemi və siniflərin, bütün növ şagirdlərin, müxtəlif ehtiyacları və bacarıqları olan öyrənənlərin də əhatə ediləcəyi şəkildə tərtib və tətbiq olunan yanaşmaları özündə ehtiva edir. Bu təhsil yanaşması tələbələrin irq, dil, cins, öyrənmə çətinliyi, sosial-iqtisadi vəziyyət və ya digər xüsusiyyətlərinə baxılmadan bərabər təhsil imkanlarına sahib olduğunu vurğulayır. İnklüziv təhsilin qarşısında duran məqsədlərinə bütün şagirdlərin təhsil prosesinə qoşulmaq, uğur qazanmaq və sosial inteqrasiyasını təşviq etməyi aid etmək olar. Bu məqsədlərdən irəli gələn əsas prinsiplər isə aşağıdakılardır:

➢ Hər kəs üçün bərabər fürsətlər: İnklüziv təhsil, hər bir tələbənin bərabər öyrənmə haqqına sahib olduğunu qəbul edir. Öyrənənləri kateqoriyalaşdırmadan təhsilə daxil olmaq imkanlarını dəstəkləyir. Heç kəs təhsil almaq hüququndan məhrum edilə bilməz (5).

➢ Fərqlilikləri dəyərləndirmək imkanı: İnklüziv təhsil, şagirdlərin müxtəlif ehtiyaclarını və bacarıqlarını qiymətləndirir və bu fərqlilikləri zənginlik kimi qəbul edir. Hər bir şagirdin unikal xüsusiyyətləri onun üstünlüyüdür. Bu, sosial bərabərsizliyi azaltmaq və ayrıseçkiliyi rədd etmək üçün bir yol hesab olunur. Beləliklə, inklüziv təhsil təkcə əlilliyi olan şəxsləri məhdudlaşdıra bilənlər üçün əlçatanlığı və imkanları yaxşılaşdırmaqdan ibarət deyil. Bu, həm də uşağa başqaları tərəfindən mənfi baxış tərzinin aradan qaldırılmasında özünü göstərən üsuldur.

➢ Diferensial öyrənmə mühiti: İnklüziv təhsil, şagirdlərə fərdiləşdirilmiş öyrənmə təcrübələri təqdim edir. Hər bir uşağın öyrənmə sürəti və üslubu müxtəlif olduğu üçün təhsil proqramları bu fərqliliyi nəzərə almalıdır. Bu, müxtəlif mədəniyyətlərdən olan şagirdlərin bir-birindən öyrənə biləcəyi bir mühit yaradır. Pedaqoji texnikaları, kurikulumları, tədris və təlimin digər aspektlərini öyrənənlərin müxtəlif ehtiyac və qabiliyyətlərinə uyğunlaşdırmaq üçün bir çox üsullar mövcuddur. Universal dizayn və diferensiallaşdırılmış təlim məktəbdə təhsili geniş şagirdlər üçün əlçatan edə bilən iki strategiya növüdür.

➢ Əməkdaşlıq və Kommunikasiya: İnklüziv siniflər şagirdlər arasında əməkdaşlığı və müsbət kommunikasiyanı bərpa edir. Şagirdlər müxtəlif xüsusiyyətlərə malik olan həmyaşıdları ilə işləyərək empatiya və sosial bacarıqlarını inkişaf etdirirlər.

➢ Çətinlikləri aradan qaldırmaq: İnklüziv təhsil, təlim prosesində çətinlikləri aradan qaldırmağı hədəfləyir. Bu çətinliklər fiziki, hissi, psixoloji və ya digər sahələri əhatə edə bilər. Məhz bu zaman şagirdlərin tələbatı müəyyənləşdirilir, onlar üçün keyfiyyətli öyrənmə şəraiti təmin edilir.

➢ Dəstəkləyici təlim: İnklüziv təhsil tətbiq edilən sinif mühitinin, hətta məktəbin ümumi mədəniyyəti təkmilləşdiyi üçün belə bir müsbət şərait bütün şagirdlərin özlərini təhlükəsiz hiss etmələrinə səbəb olur, nəticədə təlim müvəffəqiyyətində artım yaranır (Loreman, Deppeler, Harvey, 2020: 120).

*İnklüziv təhsilin əsas prinsipləri bərabərlik, müxtəlifliklərə hörmət, fərdiləşdirilmiş təhsil, əməkdaşlıq, maneələrin aradan qaldırılması və təhsil mühitinin yaxşılaşdırılması kimi tərkib hissələrini əhatə edir. Bu prinsiplər, inklüziv təhsilin açar sözləridir və hər bir uşağın*

*müvəffəqiyyətli bir təhsil təcrübəsinə sahib olmasını təmin etmək üçün təməl anlayışlardır. Təhsil insanların* bilik, bacarıq, dəyər, inanc və vərdişlər qazanılmasının asanlaşdırılması prosesi *olduğundan, təhsil sisteminin hər kəs üçün ədalətli və bərabər şəkildə əlçatan olması son dərəcə əhəmiyyətlidir. Bu məqamda inklüziv təhsil konsepsiyası işə düşür. İnklüziv təhsil hər bir şagirdin qəbul və hörmət edildiyi, özünü dəyərli hiss etdiyi bir təhsil mühiti yaratmağı, eyni zamanda onların cins, yaş, etnik, dil, din, əlillik vəziyyəti və ya digər xüsusiyyətlərinə baxmayaraq təhsil hüququna sahib olduğunu müdafiə edir (Cavadova, 2011: 232-236). İnklüziv təhsil şagirdlərin birlikdə öyrənmə təcrübələrinin onların inkişafı baxımından daha məhsuldar olabiləcəyi yanaşmanı əldə rəhbər tutur. Bununla da cəmiyyətdə insanların bir – birini daha yaxşı başa düşmə bacarığının formalaşmasına kömək edir.* İnklüziv təhsil, sadəcə bir təhsil yanaşması deyil, dəyərlərin aşılanması və bərpa edilməsi prosesidir. Bundan əlavə, inklüziv təhsil cəmiyyət üçün transformasiya vasitəsidir. İnklüziv təhsil alan fərdlər öz cəmiyyətlərini daha açıq fikirli və tolerant bir yerə çevirmək potensialına malikdirlər. Bu, sosial sülhü təşviq edir və daha yaxşı gələcək üçün zəmin yaradır. Bu yanaşma hamının bərabər hüquqlara malik olduğu bir dünya qurmaq yolunda mühüm addımdır və cəmiyyətimizi daha yaxşı gələcəyə doğru hərəkət etdirmək üçün güclü vasitədir (Yucel, 2018: 42).

İnklüziv təhsil təkcə təhsil sistemi üçün deyil, həm də cəmiyyətin ümumi rifahı üçün bir çox üstünlüklər təklif edir. İnklüziv təhsil alan fərdlər daha sonra işçi qüvvəsinə töhfə vermək potensialına malikdir. Cəmiyyətin iqtisadi inkişafına da xidmət edən yeni strategiya bütün təbəqədən olan insanların rifahına fayda verən bir yanaşmadır. Bununla belə, bu yanaşmanın həyata keçirilməsi həm təhsil alanlar, həm də müəllimlər üçün bəzi xüsusi maneələr və çətinliklər yarada bilər. Eyni zamanda, təhsil müəssisələri də inklüziv təhsilin səmərəli həyata keçirilməsi üçün qarşılaşdıqları bəzi çətinliklərlə üzləşməli olurlar. Öyrənənlər üçün problemlər aşağıdakıları əhatə edə bilər (Əhmədov, 2010):

- Fərqli öyrənmə ehtiyacları: İnklüziv siniflərdə müxtəlif öyrənmə ehtiyacları olan şagirdlər bir araya gəlir. Bu o deməkdir ki, müəllimlər fərdi təlim planları yaratmalı və həyata keçirməlidirlər.
- Sosial təcrid və ayrıseçkilik: Bəzi şagirdlər fərqliliklərinə görə sosial təcrid və ya ayrıseçkiliyə məruz qala bilərlər. Bu, psixoloji və emosional çətinliklərə səbəb ola bilər.

Tərbiyəçilər üçün problemlər aşağıdakıları əhatə edə bilər:

- Müəllim əməkdaşlığı: İnklüziv təhsil müəllimlər arasında daha sıx əməkdaşlıq tələb edir. Vaxt və resursların idarə edilməsində yaranan problemlər müəllimlərin dərsdən əvvəl öz bacarıqlarını təkmilləşdirmək üçün bir araya gəlməsinə maneə ola bilər.
- Adekvat resursların olmaması: İnklüziv təhsil daha çox resurs və dəstək xidmətlərinə ehtiyac duyur. Bu resursların olmaması müəllimlər üçün problem ola bilər.
- Fərqli öyrənmə üslubları və sürətləri: İnklüziv siniflərdə uşaqların müxtəlif öyrənmə üslubları və templəri var. Ona görə də, müəllimlərin bütün şagirdlərin fərdi-psixoloji və yaş xüsusiyyətlərini bilməsi vacibdir.
- Pedaqoqların təlimi: İnklüziv təhsil pedaqoqlardan xüsusi ehtiyacı olan tələbələrlə işləmək bacarıqlarını daim inkişaf etdirməyi tələb edir.

Təhsil müəssisələri üçün problemlər aşağıdakıları əhatə edə bilər:

- Fiziki maneələr: Məktəblərin fiziki infrastrukturu inklüziv təhsil üçün uyğun olmaya bilər. Əlçatanlıq problemləri həll edilməli olan mühüm məsələdir. İnklüziv sinif otaqları ümumiyyətlə daha çox tələbə qəbul edir. Siniflərin məhdud sayda öyrənənlər üçün olması isə əldə ediləcək uğurları məhdudlaşdıra bilər.
- Əvəzedici təhsil proqramları: İnklüziv təhsil əvəzedici təhsil proqramlarının azaldılması və ya ləğv edilməsi zərurəti ilə nəticələnə bilər.

İnklüziv təhsil sistemlərinin uğurla həyata keçirilməsi üçün bu problemlər həll edilməlidir. Pedaqoqlar, tələbələr və təhsil müəssisələri bu çağırışlara cavab vermək və inklüziv təhsilin potensialını tam şəkildə açmaq üçün əməkdaşlıq etməlidirlər. İnklüziv təhsil təhsil sistemini daha ədalətli və inklüziv etmək məqsədi daşıyan bir yanaşmadır. Bu yanaşmanın tətbiqi müsbət nəticələr verdi və bütün dünyada uğur hekayələri yaratdı. İnklüziv təhsilin bir çox müsbət nəticələri var.

Onun müxtəlif şagirdlərin həyatına necə təsir etdiyi görünəndir. İnklüziv təhsil sayəsində əlilliyi olan şagirdlər ənənəvi siniflərə daxil edilərək bərabər təhsil imkanlarından yararlana bilərlər. Bu şagirdlər təkcə akademik uğur qazanmır, həm də sosial bacarıqlarını artırırlar (Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu, 2009: 30). Məsələn, eşitmə əlilliyi olan şagird eşitmə cihazları və surdotərcüməçilər sayəsində dərslərdə daha effektiv iştirak edə bilər. İnklüziv sinif otaqları uşaqların müxtəlif dil bacarıqlarına malik olduqda dil öyrənmələrini də dəstəkləyir. Məsələn, yeni immiqrant tələbə sinif yoldaşları ilə öyrənmək imkanı əldə edir, digər tələbələr isə müxtəlif mədəniyyətləri və dilləri araşdırır. İnklüziv təhsil şagirdlərin xüsusi istedadlarını kəşf və inkişaf etdirməyə təşviq edir. Onlar incəsənət, musiqi, idman və digər sahələrdə müvəffəqiyyət əldə etmək imkanı qazanırlar. İnklüziv siniflər tələbələrə müxtəlif həmyaşıdları ilə birlikdə öyrənməyə imkan verir. Bu uğur hekayələri inklüziv təhsilin təkcə fərdlər üçün deyil, həm də cəmiyyətlər üçün necə transformativ təsir göstərə biləcəyini göstərir. Şagird autizm spektr pozuntusu olan dostu ilə layihə üzərində işlədikdə, onlar təkcə akademik bilik əldə etmir, həm də empatiya, səbr və əməkdaşlıq bacarıqlarını inkişaf etdirir. Bu cür əməkdaşlıq inklüziv təhsilin sosial təsirlərini vurğulayır. Şagirdlərin müxtəlif ehtiyaclarına cavab vermək üçün müəllimlər mütəmadi olaraq görüşür, bilik və təcrübə mübadiləsi aparırlar (Florian, 2008: 202-208). Şagirdlərə daha yaxşı dəstək vermək və müəllimlərin peşəkar inkişafına kömək etmək imkanı verən inklüziv təhsildə ən yaxşı təcrübələrin olduğu əsas məqamlardan biri şagirdlərin xüsusi təhsil ehtiyaclarını müəyyən etmək və bu ehtiyaclar əsasında fərdiləşdirilmiş təhsil planlarını (FTP) yaratmaqdır. FTP-lər öyrənənlərin güclü və zəif cəhətlərini müəyyən edir və müəllimlərə rəhbərlik edir. Fərdi fərqlər (öyrənmə qabiliyyətləri, öyrənmə üstünlükləri, üstünlük təşkil edən intellekt sahələri) təhsil prosesində nəzərə alınmadıqda, şagirdin akademik uğurunun azalmasına səbəb ola bilər. Bu cür kontekstdə müəllimlər inklüziv təhsil anlayışına uyğun hərəkət etməli, tədris prosesini şagirdlərin fərqlilikləri əsasında zənginləşdirməli və hər kəs üçün uğurlu təhsil təcrübəsini təmin etməlidir (Həsənova, 2011: 238). Ədəbiyyatda inklüziv təhsil bir ideologiya kimi qeyd edilsə də, Ainscow-un fikrincə, hamı üçün təhsil prinsipini əhatə edən inklüziv təhsili reallaşdırmaq üçün təkcə ekoloji və fiziki amilləri qeyd etmək kifayət deyil, bütün maraqlı tərəflər təhsil xidmətinin (müəllim, məktəb rəhbərliyi, şagird, valideyn, proqram və s.) yenidən islahata ehtiyacı var. İnklüziv təhsil yanaşması üçün vahid baxış lazımdır (Hüseynzadə, 2013: 708).

İnklüziv təhsillə bağlı üç növ problem və ya dilemma xüsusilə sinif idarəçiliyinə aiddir. Birincisi, uğurlu təlim mühiti üçün zəruri olan nizamın, strukturun və təhlükəsizliyin necə yaradılması və saxlanması problemi var. Sinif otaqları, bütün digər sosial vəziyyətlər kimi, gündəlik fəaliyyətləri və qarşılıqlı əlaqə nümunələrini ehtiva edir (İnklüziv təhsil günün tələbidir, 2012; Minow, 1991). Müəllimlər bütün tələbələrini öyrənmə və icma quruculuğunun baş verdiyi sosial rituallara daxil etmək yollarını axtarırlar. Onlar həmçinin potensial pozuntuları aradan qaldırmaq üçün yaradıcı, konstruktiv yollar tapmağa çalışırlar. Beləliklə, effektiv idarəetmə təkcə tələbələrin öyrənmə ehtiyaclarını ödəmək deyil, həm də onların davranışlarını tənzimləməyə kömək etməkdir. İkincisi, həm adətən inkişaf edən, həm də xüsusi ehtiyacları və əlilliyi olan tələbələrin öyrənmə, sosial və inkişaf ehtiyaclarını necə qarşılamaq problemi var. Burada məqsəd hər bir fərdin potensialını maksimum dərəcədə artırmaqla yanaşı, hər bir uşağa çata bilən akademik və sosial kurrikulumlar hazırlamaq və həyata keçirməkdir. Üçüncüsü, "fərqli" kimi qəbul edilənlərin damğalanması riski ilə necə mübarizə aparmaq problemi var. Başqa sözlə, hətta bu problemləri minimuma endirmək üçün yaradılmış şəraitdə belə, ortaya çıxa biləcək hərfi və simvolik istisnaların çoxsaylı formalarını tanımaq və azaltmağa çalışmaq lazımdır (UNICEF, 2004).

## Nəticə

Effektiv inklüziv mühitdə müəllimlər və işçilər uşağa sinifdə fəaliyyət göstərməyə kömək etmək üçün yaradıcı yollar tapmağa açıqdırlar. Məqsəd bütün uşaqların öyrənmələrini yerinə yetirmək və sinif icmasının üzvü olmaq üçün lazım olanlarla təmin etməkdir. Yuxarıda qeyd edildiyi kimi, məktəb günü bir sıra sosial rituallardan ibarətdir, o mənada ki, tələbələr və müəllimlər hər gün təkrarlanan müntəzəm qarşılıqlı əlaqədə olurlar. Məktəbəqədər və erkən ibtidai siniflərdə bu

rituallara “düşmə”, “dairə vaxtı”, “seçim vaxtı”, “qəlyanaltı”, “istirahət vaxtı” və “açıq havada vaxt” daxil ola bilər. Bu rituallarda iştirak etmək üçün bəzi tələbələr fərdi dəstək formalarına ehtiyac duyurlar. Məsələn, bəzi kiçik uşaqlar sakit oturmaq və ya diqqət yetirmək üçün əlavə sensor girişə ehtiyac duyurlar. Beləliklə, uşaqlar dünyanı, təhsil isə uşaqların dünyanı dərk etmə imkanlarını dəyişdirmək bacarığına malikdir. İnklüziv təhsil mədəniyyətini mənimsəyən uşaqlar yetkinləşib cəmiyyətə inteqrasiya edildikdə təhsil mühitində nəfəs aldıqları ədalətli, bərabər və tolerant mühitlə tanış olacaqlar. Bu xüsusiyyətlərin cəmiyyətin gələcəyini formalaşdıracağını proqnozlaşdırmaq olar. İnklüziv təhsil mühitində böyüyən hər bir uşaq yetkinləşdikdə standartlar yerinə müxtəlifliyi, kənarlaşdırma yerinə qəbul etməyi, mənfi mühakimə və rəftar yerinə dözümlülük və bərabərliyi müdafiə edən fərdlərdən ibarət bir cəmiyyəti müdafiə edə biləcək. İnklüziv təhsilin həyat qabiliyyətli olması üçün müəllimlərə və məktəblərə kifayət qədər maliyyə və maddi resurslar, təlim və digər dəstək formaları verilməlidir.

## Ədəbiyyat

1. Warner, L., Lynch, S. Inclusion Strategies for Young Children: A Resource Guide for Teachers, Child Care Providers, and Parents, 246 p.
2. Altan, S. (2019). Inclusive education for all, Journal of Critical Pedagogy, pp.27-30.
3. Ainscow, M. (2002). Understanding the development of inclusive schools. London: Falmer Press, 252 p.
4. "İnsan Hüquqları haqqında Ümumi Bəyannamə". (1948). Paris: BMT.
5. "e-qanun.az"
6. Loreman, T., Deppeler, J., Harvey, D. (2020). İnklüziv təhsil, 324 s.
7. Cavadova, L.B. (2011). İnklüziv təhsilin bəzi psixoloji problemləri, XXI əsr – mülahizələr və düşüncələr. Gənc tədqiqatçıların respublika elmi-praktik konfransının materialları (15 aprel 2011). Bakı, s.232-236.
8. Yucel, Ch., Mart, C.S. (2018). Discrimination in education, equal, accessible, barrier-free life (EEEH) Magazine, 67 p.
9. Əhmədov, H. (2010). Azərbaycan Təhsilinin İnkişaf Strategiyası. Bakı: Elm.
10. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. (2009). Bakı: Hüquq ədəbiyyatı, 80 s.
11. Florian, L. (2008). Special or inclusive education: Future trends. British Journal of Special Education. № 7, pp.202-208.
12. Həsənova, İ.M. (2011). Sağlamlıq imkanları məhdud olan uşaqların cəmiyyətə adaptasiyası. Metodik vəsait. Bakı: ADPU, 238 s.
13. Hüseynzadə, R.L. (2013). Pedaqogika. Dərslik. Bakı: Mütərcim, 708 s.
14. İnklüziv təhsil günün tələbidir. (2012). Azərbaycan məktəbi. № 4.
15. Minow, M. (1991). Making all the difference: Inclusion, exclusion and American law. Ithaca: Cornell University Press.
16. UNICEF. (2004). The State of the World’s Children 2004. Childhood under threat. New York: UNICEF.

Göndərilib: 28.08.2023 Qəbul edilib: 04.10.2023

DOI: https://doi.org/10.36719/2663-4619/95/59-64

**Zeynəb Rüstəmova**
Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası
ORCID: 0009-0000-0681-1582
zeynab.rustamova@sport.edu.az

# MÜASİR ALMAN DİLİNƏ DAXİL OLAN YENİ VƏ XARİCİ JARQONLAR (SLEQANLAR) VƏ ONLARIN DİLƏ TƏSİRİ

**Xülasə**

Məqalə gənclərin müasir alman dilində olan danışıq və ifadə vasitələrinin öyrənilməsinə həsr edilmişdir. Sosial linqvistika, mədəniyyətlərarası ünsiyyət, ekolinqvistika və praqmalinqvistika sahəsində bilikləri birləşdirəcək gənclər jarqonunun hərtərəfli tədqiqini zəruri görür. Bu çərçivədə alman gənclərinin müasir dilinin aşağıdakı aspektləri nəzərdən keçirilir: struktur (söz əmələ gəlməsi, lüğətin zənginləşdirilməsi), semantik (sistemdaxili münasibətlər) və praqmatik (alman gənclərinin nitq davranışı).

Məqalə müasir gənclik jarqonunun alman dilində çoxölçülü təsvirindədir. Burada gənclik jarqonunun söz yaradıcılığı və semantik xüsusiyyətlərini müəyyən etmək üçün gənclik jarqonunun müasir leksikoqrafik mənbələrindən götürülmüş və əvvəllər təhlil olunmamış material təhlil edilir. Alman gəncləri öz dəyərlərini, duyğularını və dünyagörüşlərini dildə ən dəqiq ifadə edən leksemlər yaratmaq üçün müxtəlif sözyaratma üsullarından istifadə edirlər. Alman gənc jarqonunun lüğəti söz yaratmaq üsulu ilə tamamlanır.

Ünsiyyət üçün jarqonlar və sleqanları müəyyən etmək üçün müasir alman gənclərinin gündəlik ünsiyyətindən nümunələr nəzərdən keçirilir.

Bu məqalə jarqonun əsas xüsusiyyətlərini araşdırır, qrammatik komponent vasitəsilə onun fəaliyyət xüsusiyyətlərini təhlil edir.

***Açar sözlər:*** *alman dili, lüğət, jarqon, gənclik jarqonu, söz, dilçilik*

**Zeynab Rustamova**
Azerbaijan State Academy of Physical Education and Sports
ORCID: 0009-0000-0681-1582
zeynab.rustamova@sport.edu.az

## New and foreign slangs entering the modern German language and their influence on the language

**Abstract**

The article is devoted to the study of young people's means of speech and expression in the modern German language. It calls for a comprehensive study of youth slang, which will combine knowledge in sociolinguistics, intercultural communication, ecolinguistics and pragmalinguistics. In this framework, the following aspects of the modern language of German youth are considered: structural (word formation, vocabulary enrichment), semantic (systematic relations) and pragmatic (speech behavior of German youth).

The article is a multidimensional description of modern youth slang in German. Here, previously unanalyzed material taken from modern lexicographic sources of youth slang is analyzed in order to determine the word creation and semantic features of youth slang. German youth use various word-building techniques to create lexemes that most accurately express their values, emotions and worldviews in the language. The vocabulary of German youth slang is supplemented by the method of word formation.

In order to identify slangs and slangs for communication, examples from everyday communication of modern German youth are considered.

obyektiv varlığın subyektiv- fərdi xüsusiyyətlərini öyrənir. Predmet (fənn)- insanı obyekt kimi elmi mövqedən şərh edir.

"Pedaqogikanın predmeti ilə bağlı, müxtəlif fikirlər vardır. Bu barədə ən geniş yayılmış fikir belədir ki, pedaqogikanın predmeti tərbiyədir... Burada tərbiyə ən azı dörd mənada işlədilir:

1)geniş sosial mənada (bütövlükdə cəmiyyətin, sosial mühitin şəxsiyyətə təsiri);

2)geniş pedaqoji mənada (bütün təhsil-tərbiyə sisteminin, pedaqoji prosesin şəxsiyyətə məqsədyönlü təsiri);

3)dar pedaqoji mənada (şəxsiyyətin istiqamətinin və psixi keyfiyyətlərinin formalaşdırılması);

4)daha dar (lokal) mənada (konkret tərbiyə vəzifələrinin-əxlaqi keyfiyyətlərin, estetik təsəvvürlərin və zövqlərin, mədəni davranış tərbiyəsinin formalaşdırılması) (5).

Pedaqoji tədqiqatlarda ən mürəkkəb məsələlərdən biri tədqiqatın obyekti və predmeti problemidir. Uzun illər obyektlə predmeti ayırmağa, onlar arasındakı sərhədləri müəyyənləşdirməyə cəhdlər göstərilmişdir. Bu günədək "Pedaqogika elminin tədqiqat obyekti və predmeti nədir?"-sualına birmənalı cavab verilməmişdir.

"Obyekt" və "predmet" anlayışları bir-biri ilə sıx bağlı və bunların arasında oxşar cəhətlər çox olsa da, bunları eyniləşdirmək olmaz. Bunların başlıca fərqi ondan ibarətdir ki, əvvəla "obyekt" anlayışı "predmet" anlayışından genişdir; məsələn, fizikanın da, kimyanın da obyekti təbiətdir, lakin həmin elmlər təbiəti müxtəlif aspektdə öyrənir-biri maddələri və onların çevrilmələrini, digəri isə fiziki hadisələri tədqiq edir...

Pedaqogika elminin obyekti pedaqoji təcrübənin verilməsi prosesidir, predmeti isə obyektin pedaqoji aspektdə öyrənilməsi, yəni orijinalın pedaqoji modeli və ya hissəsidir "(6).

Pedqoji elm digərləri kimi eyni funksiyaları yerinə yetirir. Bu funksiyalar bir-biri ilə əlaqəlidir. Beləliklə, proqnozlaşdırmanın ilkin şərti (proqnostik funksiya) verilmiş şərtlərdə bu mövqenin irəlilədiyi qanunauyğunluqların axtarışı ilə işlərin vəziyyətinin izahıdır. Məsələn, müəyyən bir tədris metodunun səmərəsizliyinin izahı, onun istifadəsi müəyyən bir tədris materialının tələbələr tərəfindən mənimsənilməsinə səbəb olmadıqda, faktların təsviri əsasında verilə bilər.

"Pedaqoji elmin funksiyaları nəzəri və texnoloji funksiyalara bölünür. Pedaqogikanın nəzəri funksiyası üç səviyyə ilə təmsil olunur:

-təsviri- izahedici;

-diaqnostik;

-proqnozlaşdırıcı.

Birinci səviyyə qabaqcıl pedaqoji təcrübənin öyrənilməsində həyata keçirilir (təsviri səviyyə).

İkinci səviyyə pedaqoji hadisələrin vəziyyətini, müəllim və şagirdlərin fəaliyyətinin səmərəliliyini müəyyən etməyə, onları təmin edən şərtləri və amilləri (diaqnostik səviyyə) müəyyən etməyə imkan verir.

Üçüncü səviyyə pedaqoji reallığın eksperimental tədqiqatlarında həyata keçirilir ki, bu da onların əsasında (proqnostik səviyyə) bu reallığın çevrilməsi üçün modellər yaratmağa imkan verir" (7).

Pedaqogikanın nəzərdən keçirilən anlayışları bir-biri ilə qarşılıqlı vəhdətdə olub, bir-birini tamamlayır. Onlar birlikdə vahid və bütöv pedaqoji prosesi təşkil edir, şəxsiyyətin ahəngdar inkişafına kömək göstərir. Digər elmlərdə olduğu kimi pedaqogika da elmi-tədqiqatların nəticəsində inkişaf edib, yeni-yeni müddəalarla zınginləşir.

Pedaqoji tədqiqatlar təlim-tərbiyə prosesini təkmilləşdirmək, müəyyən qanunauyğun əlaqələri üzə çıxarmaq məqsədi ilə planlı şəkildə aparılan axtarışlardır.

"Pedaqoji sistemin təkmilləşdirilməsi iki yolla həyata keçirilir: 1)intensiv yol; 2)ekstensiv yol.

İntensiv yol pedaqoji sistemin daxili ehtiyatlarını işə salmaqla bağlıdır. Ekstensiv yol pedaqoji prosesə əlavə qüvvə, vaxt və vəsait cəlb olunmasını nəzərdə tutur. Məsələn, gənc nəslə daha möhkəm bilik vermək üçün təlim müddətini uzatmaq, proqramları genişləndirmək olar. Pedaqoji prosesdə yeniliklərin miqyası müxtəlif ola bilər: müəyyən bir metodu, formanı təkmilləşdirmək, yeni iş texnologiyaları tətbiq etmək, yaxud təhsil-tərbiyə sistemini yeniləşdirmək.

Respublikamızda hazırda təhsil sahəsində islahatlar aparılır, təhsilin maddi bazasına təhsil və tərbiyə işinin məzmununda, metodikasında, müəllim-şagird münasibətlərində, idarəetmədə böyük dəyişikliklər baş verir" (8).

Pedaqogika fənni müəllim hazırlığı sistemində xüsusi əhəmiyyət kəsb edir. Gələcək müəllimlər təlim-tərbiyə texnologiyalarına, şagird nailiyyətlərinin qiymətləndirilməsi və məktəbin idarə edilməsi üsullarına pedaqogika fənninin tədrisi prosesində, həmçinin nəzəri biliklərin pedaqoji təcrübəyə tətbiqi zamanı yiyələnirlər. Pedaqogika fənninin məqsədi gələcək müəllimlərdə müasir təhsil konsepsiyaları, yeni təlim-tərbiyə tenologiyaları ilə bilik və bacarıqlar formalaşdırmaqdır.

"Pedaqogika fənn kurikulumunda 5 məzmun xətti nəzərdə tutulur:

1)Pedaqogikanın ümumi əsasları;

2)Təlim və təhsil nəzəriyyəsi (Didaktika);

3)Tərbiyənin nəzəri və praktik əsasları;

4)Məktəbin idarə edilməsi və ona rəhbərlik;

5)Təhsil tarixi və müasirlik.

Ölkəmizdə həyata keçirilən təhsil islahatlarının reallaşmasında başlıca ağırlıq müəllimlərin üzərinə düşür. Bu baxımdan pedaqoji kadr hazırlığında baza fənni kimi "Pedaqogika"nın da qarşısında bir sıra vəzifələr durur:

-müasir tələblərə cavab verən çevik təfəkkürlü, demokratik ünsiyyət üslubuna malik, sağlam əqidəli, nəzəri və praktik cəhətdən hazırlıqlı, səriştəli pedaqoji kadrların hazırlanmasını təmin etmək. Gələcək müəllimləri yeni qiymətləndirmə mexanizmi, müasir təlim texnologiyaları ilə bağlı biliklərlə formalaşdırmaq. Ali pedaqoji təhsil müəssisələrinin məzunlarında ünsiyyət, əməkdaşlıq, dialoq mədəniyyəti formalaşdırmaq" (9).

Pedaqoji elmin mənbələri və tədqiqat metodları bir-biri ilə əlaqədardır. Pedaqoji tədqiqat metodları pedaqoji metodologiyaya dayanaraq pedaqoji elmin mənbələrinə uyğun olarq seçilir. Odur ki, öncə pedaqoji elmin mənbələri barədə fikirlərimizi bölüşək, sonra pedaqoji texnologiya və tədqiqat metodları anlayışlarına elmi şərh verməyə çalışaq.

Pedaqoji elmin mənbələri müxtəlifdir: pedaqoji proses, pedaqoji sənədlər, pedaqoji mövzuda yazılar, klassiklərin əsərləri və pedaqoji fikirləri, şagirdlərin (və digər tərbiyə olunanların) fərdiyyəti, şifahi xalq yaradıcılığı nümunələri, dövlət sənədləri, canlı söz, müqəddəs kitabımız "Qurani-Kərim" və s. Xüsusi qeyd olunmalıdır ki, tədris və tərbiyə müəssisələrində həyata keçirilən pedaqoji proses pedaqoji elmin və pedaqoji biliklərin əsas mənbəyidir.

"Sadalanan mənbələri iki qrupa ayırmaq olar: 1)geniş mənada pedaqoji prosesin özü; 2)şifahi və yazılı mənbələr. Birinciyə praktika, ikinciyə təlim-tərbiyə haqqında əsaslandırılmış fikirlər, mülahizələr, dövlət sənədləri, pedaqoji ideyaları və s. daxildir" (10).

Elmin digər sahələrində olduğu kimi, pedaqogika üzrə tədqiqatlar da metodoloji əsasa istinad edir, ondan istiqamət alır. Bunsuz pedaqogikanı müvəffəqiyyətlə inkişaf etdirmək olmaz. Hər bir didaktik, metodik axtarışlar metodoloji əsasla idarə olunur. Bir sözlə, metodologiyaya əsaslanmadan həqiqi elmi tədqiqat aparmaq mümkün deyil.

"Metodologiya" yunan dilində metodlar haqqında elm" deməkdir. Metodologiya anlayışının hamı tərəfindən qəbul olunmuş tərifi yoxdur. Pedaqoji ədəbiyyatda metodologiya bəzən tədqiqatın metodik priyomlarının məcmusu, bəzən xarici aləm haqqında biliklərin əldə edilmə qaydaları, aləmin dərk olunması və yeniləşdirilməsi metodları haqqında nəzəriyyə hesab olunur. Əslində çox geniş məzmuna malik olan metodologiya rəhbər prinsiplərə istinad edən elmi tədqiqatların silahı, elmi təhlilin və sintezin tələblərinin yerinə yetirilməsinin konkret vasitəsi rolunu oynayan nəzəri biliklər sistemidir. Pedaqoji metodologiya elmi-pedaqoji tədqiqatların əsas qaydaları, quruluşu, funksiyaları və metodları haqqında təlimdir.

"R.Dekarta görə, metodologiya idrak prosesinin fəlsəfi əsaslandırılmasıdır. Hegel göstərirdi ki, idrakın bu və ya digər sahəsi üçün xarakterik olan fəlsəfi metodu konkret elmlərin metodları ilə eyniləşdirmək olmaz, metod idrak prosesinin məzmunundan asılıdır. Fəlsəfə ensiklopediyasında metodologiyanın tərifi belə verilir: "Metodologiya idrakın və varlığın dəyişdirilməsi metodları, dünyagörüşü, prinsiplərin idrtak prosesinə, ümumiyyətlə mənəvi yaradıcılığa və praktikaya tətbiqi

haqqında fəlsəfi təlimdir”. Mövcud fəlsəfi ədəbiyyatda metodologiyaya “Təbiət və cəmiyyət hadisələrinə yanaşma qaydası haqqında təlim”, “Məqsədə çatmaq, müəyyən məsələni həll etmək üçün istifadə olunan metodlar haqqında təlim”, nəzəriyyə, “Tədqiqat metodları haqqında təlim”, metodika, “Elmin bu və ya başqa bir sahəsində tətbiq olunan tədqiqat metodlarının məcmusu”, metod kimi tərif verilir” (11).

Pedaqoji tədqiqatın metodları dedikdə, müəyyən elmi problemi həll etmək üçün istifadə olunan yol və vasitələrin məcmusu başa düşülür. Bu metodları şərti olaraq dörd qrupa bölmək olar: a) emprik tədqiqat metodları; b) nəzəri tədqiqat metodları; c) emprik-nəzəri tədqiqat metodları; d) pedaqoji tədqiqatda riyazi, statistik, sosioloji metodlar.

Empirik tədqiqat metodları müəyyən faktlar toplamağa xidmət edir. Bu metodlara daxildir: pedaqoji müşahidə, pedaqoji müsahibə, anket sorğusu, pedaqoji konsilium, pedaqoji sənədlərin və fəaliyyət məhsullarının öyrənilməsi metodları. Pedaqoji müşahidə-pedaqoji prosesi müəyyən məqsədlə və planlı şəkildə izləməkdir. Tədqiqatçı müşahidə zamanı nəyi, nə məqsədlə izləyəcəyini müəyyən edir, müvafiq faktlar toplayır, onları təhlil edib qruplaşdırır və nəticə çıxarır.

“Nəzəri təhlil metodu pedaqoji hadisələri tərkib hissələrinə bölməyi, başlıca əlaməti, xüsusiyyəti ayırmağı nəzərdə tutur. Təhlil həmişə tərkiblə (sintezlə) ayrı-ayrı hissələrin, əlamətlərin əlaqələndirilməsi, ümumiləşdirilməsi metodu ilə müşayiət olunur, onunla tamamlanır. Təhlil və tərkibin vəhdəti pedaqoji hadisələrin mahiyyətini dərk etməyə, ümumidə xüsusi, xüsusidə isə ümumi cəhəti tapmağa imkan verir.

Pedaqoji tədqiqatda bəzən empirik-nəzəri metodlar əlaqəli şəkildə tətbiq olunur. Belə metodlara eksperiment, təcrübi-eksperimental iş, sınaq metodları daxildir”.

## Nəticə

Aparılmış tədqiqat işindən göründüyü kimi, müəllif pedaqogikanın predmetini, funksiyalarını, məqsədini, vəzifələrini, mənbələrini və metodologiyasını hərtərəfli araşdırmışdır. Müəllif araşdırmasında pedaqogikanın ümumi, uşaq, pedaqoji və sosial psixologiya ilə əlaqədar olduğuna diqqəti cəlb etməyə çalışmışdır. Eyni zamanda müəllif belə qənaətə gəlmişdir ki, pedaqogikanın bir elm kimi obyekti pedaqoji proses və onun mərkəzində duran insandır.

## Ədəbiyyat

1. Məktəbəqədər pedaqogika. (1964). Bakı: Maarif nəş., 246 s.
2. Paşayev, Ə., Rüstəmov, F. (2002). Pedaqogika, Bakı: Çaşıoğlu nəş., 512 s.
3. Talıbov, Y., Ağayev, Ə., Eminov, A., İsayev, İ. (2006). Pedaqogika: Adiloğlu nəş., 184 s.
4. https://gender.org>1-pedaqogikanın...
5. https://azkurs.org>movzu-ali-mekt…
6. https://elibrary.bsu.edu.az>files
7. https://tfmarket.ru>sekrety-stilya
8. https://azkurs.org>pedaqogikanın...
9. https://genderi.org>1-pedaqogikanın...
10. https://gender.org>pedaqogika-elm…
11. https://muhaz.org>annotasiya-v
12. https://kayzen.az>blog>pedaqoji…

Göndərilib: 06.08.2023 Qəbul edilib: 23.09.2023

DOI: https://doi.org/10.36719/2663-4619/95/75-79

**Nurəngiz Tağıyeva**
Azərbaycan Dövlət Pedaqoji Universitetinin Ağcabədi filialı
cavidhaciyev852@gmail.com

# STRESSİN PSİXOLOJİ SAĞLAMLIĞA TƏSİRİ VƏ ONUNLA MÜBARİZƏ TƏDBİRLƏRİ

**Xülasə**

Stress fiziki və zehni sağlamlığımıza mənfi təsir göstərən ümumi bir problemdir. Stressə müxtəlif amillər səbəb ola bilər, o cümlədən yanma sindromu, şəxsi problemlər, maliyyə, sağlamlıq problemləri, xroniki stress psixi sağlamlığa mənfi təsir göstərə bilər. Məqalədə stressin psixi sağlamlığa təsiri və stresslə mübarizə üsulları haqqında məlumat verilmişdir. Stressin psixi sağlamlığa təsirinin qarşısını almaq və ya azaltmaq üçün fərdi stress idarəetmə planı yaratmaq vacibdir. Hər kəsin streslə mübarizə üsulları fərqlidir, ona görə də effektiv metodların tapılması və tətbiqi insanın özünü daha yaxşı hiss etməsinə kömək edə bilər. Stress, narahatlıq və depressiya kimi psixi sağlamlıq problemləri riskini artıra bilər. Uzunmüddətli stress psixi funksiyalara təsir edə bilər və psixoloji pozuntulara səbəb ola bilər.

***Açar sözlər:*** *stress, sağamlıq, zehin, depressiya, metod*

**Nurangiz Taghiyeva**
Aghjabadi branch of Azerbaijan State Pedagogical University
cavidhaciyev852@gmail.com

## Impact of stress on psychological health and measures to combat it

**Absract**

Stress is a general problem that has a negative impact on our physical and mental health. Stress can be caused by various factors, including burning syndrome, personal problems, financial problems, health problems, and chronic stress psychiatry can have negative effects on health. In the article, information is given about the effect of stress on psychological health and methods of combating stress. It is important to create an individual stress management plan to counteract or reduce the impact of stress on mental health. Everyone's methods of dealing with stress are different, so finding and applying effective methods can help a person feel better. Stress can increase the risk of mental health problems such as anxiety and depression. Long-term stress can affect psychological functions and cause psychological disorders.

***Keywords:*** *stress, health, mind, depression, method*

## Giriş

Bu gün hər bir fərdin sürətlə dəyişən və inkişaf edən texnoloji, iqtisadi və sosial şəraitə uğurla uyğunlaşması mümkün deyil və bununla bağlı fərdlərdə müxtəlif fiziki/psixi sağlamlıq problemləri yaranır. O da məlumdur ki, stressli həyat hadisələrinə məruz qalan hər bir insan oxşar sağlamlıq problemləri ilə üzləşmir. Lazarus və Folkman qarşılıqlı stres və mübarizə nəzəriyyəsinə əsaslanaraq, stress və sağlamlıq arasındakı əlaqədə rol oynadığı iddia edilən müxtəlif psixoloji faktorları və bu amillərin bir-biri ilə əlaqəsini tədqiq etmişlər (Lazarus, Folkman, 1984: 254). Nəzəriyyə stress və onunla mübarizə üçün model təklif edir və stressi bir proses olaraq qiymətləndirir. Bu yolla stress nəticəsində fiziki və psixi sağlamlığımıza mənfi təsir göstərən faktorların və onların aradan qaldırılmasının əhəmiyyəti hədəflənir. Stress sağlamlığımızda neqativ nəticələrin yaranmasına təsir edən əsas hisslərdən biridir. Psixoloji ədəbiyyatlarda bir çox araşdırmalar göstərir ki, stress ilə fiziki və psixi sağlamlıq arasındakı əlaqə danılmazdır. Bununla əlaqədar olaraq, stresslə effektiv mübarizə üsulları tez-tez araşdırılır və həyata keçirilməsi üçün təlim proqramları planlaşdırılır. Ancaq

vurğulanması lazım olan ən vacib məqamlardan biri də stressli həyat hadisələri ilə qarşılaşan hər bir fərdin stres reaksiyasının oxşar olmamasıdır. Ona görə də birinci mərhələdə təkcə stresslə mübarizə diqqət mərkəzində olmamalıdır (Adler, Boyce, Chesney, Cohen, Folkman, Kahn, Syme, 1994: 24). Stresslə qarşılaşan lakin oxşar sağlamlıq problemləri olmayan şəxslər üçün hansı psixoloji faktorların qoruyucu olduğuna diqqət yetirilməlidir. Lazarus və Folkmanın (1984) stresslə mübarizə nəzəriyyəsində irəli sürülən modeli stresi fərd və ətraf mühit arasındakı interaktiv bir proses olaraq qiymətləndirir və bir çox daxili və xarici faktorların rol oynadığı bu proses nəticəsində fərdlərin sağlamlıq problemlərinə məruz qaldığını iddia edir. Modelə görə, fərd stress mənbəyinin təhlükə və ya zərərliliyini qiymətləndirdikdən sonra mənbənin idarə oluna bilib-bilmədiyini qiymətləndirilir. "Stressin qiymətləndirilməsi" adlanan bu mərhələdən sonra fərdin öz qiymətləndirmələrinə uyğun mübarizə üsullarından istifadə etdiyi "mübarizə" mərhələsi başlayır. Əgər fərd stress mənbəyini zərərli və idarəolunmaz kimi qiymətləndirirsə, problemi aradan qaldırmağa yönəldilmiş tədbirlər intellektual yox, emosional mübarizə metodlarını özündə cəmləşdirir. Bunun nəticəsində onlar sağlamlıq problemlərinə məruz qalırlar. Beləliklə, modelə görə stress dəyərləndirmələri və nəticələri arasındakı əlaqədə mübarizə tədbirləri vasitəçi rol oynayır. Stressin psixi sağlamlığa təsirini araşdıran bir çox tədqiqatçı və mütəxəssis var. Stressin psixi sağlamlığa təsirini araşdıran tədqiqatlar psixologiya, psixiatriya, nevrologiya və digər əlaqəli sahələrdə aparılır. Bu sahədə bəzi görkəmli tədqiqatçılar ətraflı məlumat vermişlər (Andrews, Wilding, 2004: 509-521):

1. Hans Selye stressin fizioloji təsirlərini araşdıraraq onun insan sağlamlığına təsiri anlayışını əsaslı şəkildə inkişaf etdirən bir alimdir.
2. Richard Lazarus: Lazarus stressin insanların düşüncə və hisslərinə necə təsir etdiyini tədqiq edən qabaqcıl psixoloq idi. O, stressin qiymətləndirilməsinə və stresslə mübarizə strategiyalarına mühüm töhfələr verib.
3. Robert M. Sapolski: Nevrologiya professoru Sapolski stressin beyin və bədənə bioloji təsirlərini araşdırıb və bu mövzuda çoxlu araşdırmalar aparıb.
4. Susan Folkman: Lazarusun əməkdaşı olan Folkman stressə emosional və psixoloji reaksiyaları anlamaq üçün çalışdı və "streslə mübarizə" konsepsiyasını inkişaf etdirdi.
5. George Fink: O, stressin yaratdığı fizioloji dəyişiklikləri və bu dəyişikliklərin sağlamlığa təsirini öyrənən neyrobioloqdur.
6. Elissa Epel: Epel stressin hüceyrə qocalmasına və sağlamlığa təsirlərini araşdıran mütəxəssisdir və "telomerlər" üzərində işi ilə tanınır.
7. Richard Davidson: Davidson stresin aradan qaldırılmasında meditasiya və ağıl təlimi kimi metodların təsirlərini araşdıran bir nevroloqdur.

Bu tədqiqatçılar stressin psixi sağlamlığa təsirini anlamaqda və stresslə mübarizə strategiyalarının işlənib hazırlanmasında mühüm töhfələr vermişlər. Onların araşdırmaları stressi azaltmaq və psixi sağlamlığı qorumaq üçün təlimat verə bilər.

Stress sözünü ilk dəfə fizika sahəsində çalışan alimlər işlətmişlər. 17-ci əsrdə Robert Huk elastik cisimlə ona tətbiq olunan xarici qüvvə arasındakı əlaqəni izah etmək üçün stress anlayışından istifadə etmişdir. 18-ci əsrdə Thomas Young adlı dahi fizik stressi maddənin içindəki qüvvə və ya müqavimət olaraq təyin etdi. Maddə yalnız öz gücünə uyğun olaraq bu xarici müqavimətə reaksiya verə bilər və bu gərginlik reaksiyası sayəsində elastik kütlə əyilərək, burularaq xarici müqavimətə uyğunlaşır. Əgər xarici müqavimət maddənin özüdürsə onun daxili gücündən artıqdırsa onda ya forması pozular ya da maddə qırılar (Bolger, Schilling, 1991: 355-386). Tibbdə isə ilk dəfə 19-cu əsrdə fizioloq Bernard tərəfindən istifadə edilmiş, "orqanizmin tarazlığını pozan stimullaşdırıcılar" olaraq təyin edilmişdir. Stress anlayışının sosial kontekstdə bəla, qəm, kədər və fəlakət mənasında ilk dəfə işlədilməsi 17-ci əsrə təsadüf edir. 18-19-cu əsrlərdə daha çox güc, təzyiq, çətin vəziyyət, fərdin xarici qüvvələrin təsiri altındakı psixoloji və emosional sıxıntısı mənasında obyektə, şəxsə və ya mənəvi quruluşa istinad edirdi. Stress sözü zamanla bir çox sahədə istifadə olunmağa başlamışdır. Hazırda stress anlayışı ilə bağlı çoxlu araşdırmalar aparılır və bu araşdırmalara uyğun olaraq psixoloji ədəbiyyatda stressin müxtəlif tərifləri mövcuddur. Ən ümumi təriflərdən birini edən McGrath'a görə, stress ətraf mühitdə tələbatlar və onların ödənilməsi imkanları arasında olan

ziddiyyətdən yaranır. Cüceloğluna görə stress insanın sosial mühitdə qarşılaşdığı problemləri aradan qaldırmaq üçün sərf etdiyi əməkdir (Cuceloglu, 2000: 252). Baltaşa görə stress orqanizmin fiziki və mənəvi sərhədlərinin təhdid edildiyi zaman yaranan vəziyyətidir (Baltash, 2012: 150).

Stressə müxtəlif perspektivlərdən baxan araşdırmalar da var. Selye stressi dörd kateqoriyaya ayırır: həddindən artıq stress, qeyri-kafi stress, eustress və distress. Selye insanların məqsədinin distressi alt, eustressi üst səviyyədə tutmaq, qeyri-kafi və həddindən artıq stress arasındakı balansı isə qorumaqdan ibarət olduğunu vurğulamışdır (Shahin, 2014: 240).

Stress və sağlamlıq arasındakı əlaqəni izah edən bir çox tədqiqat stresin fizioloji reaksiyalar yaratdığını vurğulayır. Stress mənbələri fərd tərəfindən təhdidedici və ya təhlükəli kimi qəbul edilib qiymətləndirildikdən sonra bu zehni həyəcan fiziki oyanmaya çevrilir. Transformasiyanı təmin edən limbik sistemin hipotalamusla əlaqəsidir. Stress nəticəsində baş verən fizioloji reaksiyalar hipotalamusun stimullaşdırılması ilə başlayır. Daha əvvəl qeyd edildiyi kimi, stressin insanlara təsirini araşdıran ilk tədqiqatlar 1956-cı ildə Hans Selye tərəfindən aparılmışdır (McGonigal, 2015: 368). Selyenin fikrincə, stresli hadisə ilə qarşılaşan insan bəzi fizioloji, psixoloji və davranış reaksiyaları göstərir. Stressə qarşı ən əhəmiyyətli cavab reaksiyalarına narahatlıq, kədər və qəzəb aiddir. Stressli hadisələri zərər və ya itki kimi qiymətləndirən insanlarda narahatlıq hissi yaranır. Bu vəziyyətlərin öhdəsindən gələ bilmədikdə isə kədər hissi və depressiya əlamətləri artır. Folkman və Lazarus depressiyaya düşmüş insanlar digərlərinə nisbətən hadisələri daha təhlükəli və zərərli kimi qəbul edirlər. Holahan və Moos depressiya diaqnozu qoyulmuş xəstələrlə apardıqları araşdırmada onların sağlamlıqlarında problem yaranmamışdan əvvəl 1 illik müddət ərzində stresli həyat hadisələri ilə qarşılaşdıqlarını bildirmişlər. Bu insanların stresli hadisələr qarşısında qaçınma strategiyaları tətbiq etdikləri də müəyyən edilmişdir. Narahatlıq stresə digər bir cavab reaksiyasıdır. Duyğuların arxasındakı koqnitiv qiymətləndirmələrdəki fərqlilikdən başqa, depressiya və narahatlıq şikayətlərinin ümumiyyətlə stresli şəxslərdə meydana gəldiyi, bu anlayış isə "psixoloji sıxıntı" və ya "psixoloji stress reaksiyaları" kimi qəbul edilmişdir (Shahin, 1994: 123).

Məlumdur ki, stressin insanların psixi və fiziki sağlamlığına bəzi mənfi təsirləri var. Onun mənfi təsirlərini aradan qaldırmaq üçün streslə mübarizə reaksiyalarının öyrənilməsi çox əhəmiyyətlidir. Lazarus və Folkmanın (Lazarus, Folkmanın 1984: 141) fikrincə, mübarizə "insanın öz resurslarını istehlak etdiyi müəyyən daxili və ya xarici tələbatları dəf etmək üçün etdiyi daim dəyişən idrak və davranış səyləridir". Həyat boyu hər bir fərd müxtəlif təhlükələrlə, yəni stresslərlə üzləşir. Stressli görünən bir hadisənin real təsiri insanın hadisəni qiymətləndirməsindən asılıdır. Yuxarıda qeyd edildiyi kimi, Lazarus və Folkmanın stress və mübarizə modelinə görə ətrafdakı hər hansı hadisə və ya vəziyyət insanı bu hadisənin mənasını və əhəmiyyətini qiymətləndirməyə aparır. İlkin qiymətləndirmədə insan üçün potensial stresin mənası müəyyən edilir. İkinci dərəcəli qiymətləndirmədə fərd hadisənin vurduğu zərər və təhlükənin aradan qaldırılmasında rol oynayacaq mübarizə bacarıqlarını qiymətləndirir. Bu məqsədlə onun mövcud resurslarının və ya variantlarının adekvatlığını təmin etmək lazımdır. Stresslə mübarizə tədbirlərinə aşağıdakılar aiddir (Robert, 2004: 560):

1. Problem yönümlü mübarizə - stresli vəziyyəti və ya hadisəni dəyişdirmək, onun təsirini aradan qaldırmaq və ya ən azından mövcud təsirlərini azaltmaq üçün hərəkətə keçməyi əhatə edir. Fərd öz davranışını və ya mühitini dəyişdirməyi hədəfləyir. Bu yanaşmaya sahib olan insanlar öz qiymətləndirmələri nəticəsində stress mənbəyinin idarə oluna biləcəyinə inanır və hərəkətə keçərlər. Problem mərkəzli streslə mübarizə metodunun strategiyalarının bəzi ünsürləri var (Wells, 2008: 440):

❖ Problemi Tanımaq və Anlamaq: İlk addım stresin mənbəyini düzgün tanımaq və anlamaqdır. Stressin haradan gəldiyini və bunun sizə necə təsir etdiyini anlamaq bu yanaşmanın əsasını təşkil edir.

❖ Məqsədlərin qoyulması: Problemi dərk etdikdən sonra hədəflər təyin etmək vacibdir. Hansı problemləri həll etmək istədiyinizi və ya hansı təsirləri azaltmaq istədiyinizi aydınlaşdırmalısınız.

❖ Həll yollarının tapılması: Bu mərhələdə probleminizi həll etmək və ya təsirini azaltmaq üçün müxtəlif həllər tapmağa başlayırsınız. Müxtəlif variantları nəzərdən keçirərək və təhlil edərək, ən uyğun yolun hansı olduğunu müəyyən etməyə çalışırsınız.

❖ Plan hazırlamaq: Ən yaxşı həlli tapdıqdan sonra plan qurursunuz. Bu plana addımlar, resurslar və vaxt qrafiki daxil edilməlidir.

❖ Tədbir görmək: Planı həyata keçirmək üçün tədbirlər görmək vacibdir. Bu mərhələdə siz müəyyən etdiyiniz addımları ataraq stress mənbəyini həll etməyə başlayırsınız.

❖ Nəticələrin qiymətləndirilməsi: Həllləri tətbiq etdikdən sonra siz nəticələri qiymətləndirirsiniz. Problemi necə effektiv şəkildə həll etdiyinizi və ya onun təsirlərini azaltdığınızı nəzərdən keçirirsiniz.

Problemə yönəlmiş mübarizə strategiyası, xüsusilə idarə oluna bilən problemlər üçün effektiv bir yanaşma ola bilər. Ancaq bəzən bəzi vəziyyətləri idarə etmək və ya dəyişdirmək mümkün olmur, buna görə də emosional fokuslanmış mübarizə strategiyaları da vacibdir. Yaxşı mübarizə strategiyası bəzən emosional, bəzən də problem yönümlü yanaşmadan istifadə edərək hamıya uyğun olanı seçməkdir (Tarhan, 2004: 304).

2. Emosiyaya əsaslanan mübarizə - stresli vəziyyət nəticəsində yaranan mənfi emosiyaların idarə olunmasını və müsbət nöqtəyə yönəldilməsini təmin edir. İnsanlar stresli vəziyyətin idarə oluna bilməyəcəyini hiss etdikdə emosional gərginliyi azaltmaq ya da aradan qaldırmaq üçün bu strategiyalara əl atırlar. Emosiya mərkəzli mübarizədə problem yönümlü mübarizədən fərqli olaraq məsafə saxlamaq, özünü idarə etmək, ediləcək bir şey olmadığı halda vəziyyəti qəbul etmək kimi passiv üsullar, sosial dəstək axtarmaq və vəziyyəti yenidən qiymətləndirməklə istifadə edilən metodlardandır (Shahin, 2014: 215). Duyğuya əsaslanan mübarizə strategiyasının bəzi elementləri bunlardır:

❖ Uzaqlaşma: Stressli bir vəziyyətin öhdəsindən gəlmək üçün bir insan vəziyyətdən uzaqlaşaraq və ya rahatlaşdırıcı fəaliyyətlərlə məşğul olaraq fasilə verməyi seçə bilər. Məsələn, təbiətdə gəzintiyə çıxmaq və ya sevimli hobbi ilə məşğul olmaq stressi azalda bilər.

❖ Özünə Nəzarət: Emosiyaya əsaslanan mübarizə emosional reaksiyalara nəzarət etməyi əhatə edir. İnsan öz duyğularını anlamağa çalışır və ekstremal reaksiyalardan qaçaraq daha balanslı əhval-ruhiyyə yaratmağı qarşısına məqsəd qoyur.

❖ Vəziyyəti qəbul etmək: Bəzi vəziyyətləri dəyişdirmək və ya idarə etmək mümkün deyil. Bu vəziyyətdə insan stresli vəziyyəti qəbul etməyi öyrənməlidir. Beləcə vəziyyəti olduğu kimi qəbul edərək, dincliyi qorumağa kömək edə bilər.

❖ Sosial Dəstək Axtarmaq: Sosial dəstək emosiyaya əsaslanan mübarizədə vacibdir. Dostlar, ailə üzvləri və ya terapevt kimi insanlardan dəstək almaq emosional yükü yüngülləşdirə bilər.

❖ Vəziyyətin yenidən qiymətləndirilməsi: Bir insan stresli vəziyyəti fərqli bir baxımdan qiymətləndirməyə çalışa bilər. Bu, ona vəziyyəti daha müsbət və ya idarə edilə bilən şəkildə görməyə kömək edə bilər.

Emosiyaya əsaslanan mübarizə problem mərkəzli mübarizə strategiyası ilə birlikdə istifadə edildikdə stressin öhdəsindən səmərəli şəkildə çıxmağa kömək edə bilər. Stressin növündən, şiddətindən və insanın fərdi üstünlüklərindən asılı olaraq müxtəlif strategiyalardan istifadə oluna bilər (Davis, Eshelman, Matthew: 156). Yaxşı mübarizə bacarıqlarına hər iki strategiyadan lazımi şəkildə istifadə etmək bacarığı daxildir. Stresslə mübarizə yolları çox müxtəlif ola bilər və insandan insana dəyişkənlik göstərir. Stressin öhdəsindən gəlməyə kömək edə biləcək bəzi ümumi ünsürlərə isə aşağıdakılar aiddir:

❖ Fiziki məşq: Daimi fiziki fəaliyyət stressi azaltmağa və psixi sağlamlığı yaxşılaşdırmağa kömək edə bilər. Məşq, endorfin adlanan xoşbəxtlik hormonlarının ifrazına səbəb olaraq əhval-ruhiyyəni yüksəldə bilər.

❖ Dərin nəfəs: Dərin və şüurlu nəfəs narahatlığı azaltmaq üçün təsirli bir üsuldur. Yavaş-yavaş dərin nəfəs bədəni rahatlaşdırır və stressi azaldır.

❖ Meditasiya və Yoqa: Meditasiya və yoqa zehni və emosional tarazlığı bərpa etməyə kömək edə bilər. Bu təcrübələrdən stressi azaltmaq və zehni sakitləşdirmək üçün istifadə olunur.

❖ Hobbi ilə məşğul olmaq: Maraqlandığınız hobbi və ya fəaliyyətə vaxt ayırmaq stressi azalda bilər. Rəsm çəkmək, musiqiyə qulaq asmaq, kitab oxumaq və ya bağçılıq kimi fəaliyyətlər stressi aradan qaldıra bilər.

❖ Sosial əlaqələr: Dostlar və ailə ilə vaxt keçirmək emosional dəstək verə bilər. Sosial əlaqələr streslə mübarizədə mühüm rol oynayır.

❖ Vaxtın İdarə Edilməsi: Vaxtın idarə edilməsi bacarıqlarının təkmilləşdirilməsi işlərin daha səmərəli yerinə yetirilməsinə və vaxtla bağlı stressi azaltmağa kömək edə bilər.

❖ Yumor: Gülüş stressi aradan qaldırmaq üçün təsirli bir üsuldur. Komediya filmlərinə baxmaq, zarafatlar danışmaq və ya dostlarla gülmək sizin əhvalınızı yaxşılaşdıra bilər.

❖ İstirahət və Yuxu: Kifayət qədər yuxu bədəni doldurmaq və stressi azaltmaq üçün vacib bir yoldur. Daimi istirahət və yuxu stressin təsirini azalda bilər.

❖ Problemin həlli: Problemlərlə məşğul olmaq üçün praktik həll yolları axtarmaq stresi azalda bilər. Problemlərlə üzləşmək və müsbət dəyişikliklər etmək nəzarət hissini artıra bilər.

❖ Peşəkar Yardım: Stresslə mübarizə aparmaqda çətinlik çəkdikdə psixoloq və ya terapevtdən kömək istəməyi düşünmək vacibdir. Peşəkar yardım streslə mübarizədə daha təsirlidir.

## Nəticə

Stress və mübarizə prosesində rol oynayan digər mühüm anlayış şəxsi xüsusiyyətlərdir (Tarhan, 2004: 281). Stress səviyyəsi yüksək olan insanlar, narahatlıq və depressiya kimi şikayətləri daha çox yaşayırlar. Nevrotikliyin səviyyəsi fərdlərin stressi mənalandırmalarında, onlarla mübarizə üsullarını təyin etmələrində və psixoloji əlamətlərin ortaya çıxmasında çox əhəmiyyətli yeri olduğu qeyd edilir.

## Ədəbiyyat

1. Lazarus, Folkman. (1984). "Stress, Appraisal, and Coping", Springer, 456 p.
2. Adler, N.E., Boyce, T., Chesney, M.A., Cohen, S., Folkman, S., Kahn, R.L., Syme, S.L. (1994). Socioeconomic status and health: The challenge of the gradient. American Psychologist, 49 p.
3. Andrews, B., Wilding, J.M. (2004). The relation of depression and anxiety to life-stress and achievement in students. British Journal of Psychology, pp.509-521.
4. Bolger, N., Schilling, E.A. (1991). Personality and the problems of everyday life: The role of neuroticism in exposure and reactivity to daily stressors. Journal of Personality. № 59 (3), pp.355-386.
5. Cuceloglu, D. (2000). Human and Behavior. 10th Edition, Remzi Bookstore, Istanbul.
6. Baltash, A., Baltash, Z. (2012). Stress and ways to cope. 28th Edition Istanbul: Remzi Bookstore.
7. McGonigal, K. (2015). "The Upside of Stress: Why Stress Is Good for You, and How to Get Good at It", 368 p.
8. Shahin, N. (1994). Coping with stress. A positive approach. Ankara: Turkish Psychologists Association publications.
9. Robert, M. (2004). Why Zebras Don't Get Ulcers", Sapolsky, 560 p.
10. Wells, A. (2008). "Emotion Regulation: Conceptual and Practical Issues", 440 p.
11. Tarhan, N. (2004). Stress and Ways to Cope, 304 p.
12. Shahin, A. (2014). Stress Management: Theory and Practice, 240 p.
13. Davis, M., Eshelman, E.R., Matthew, McKay. (2020). The Relaxation and Stress Reduction Workbook", 368 p.
14. Tarhan, N. (2019). Psychological Resilience and Stress Management, 288 p.

Göndərilib: 05.08.2023 Qəbul edilib: 16.09.2023

DOI: https://doi.org/10.36719/2663-4619/95/80-87

**Nərgiz Həsənova**
Bərdə şəhər Ələddin Dadaşov adına Xanağal kənd tam orta məktəbi
nergizhesenova1975@gmail.com

# TƏNQİDİ PEDAQOGİKANIN ƏSAS KEYFİYYƏT GÖSTƏRİCİSİ

**Xülasə**

İndiki dövrdə təhsilin ən vacib məqsədlərindən biri təhsilalanların tənqidi düşünmə bacarıqlarını inkişaf etdirmək və bununla yanaşı cəmiyyət üçün hərtərəfli, düşüncəli gənclər yetişdirməkdir. Tənqidi pedaqogikanın mühüm öyrənmə strategiyası təhsilalanların analiz, qiymətləndirmə və konfiqurasiya bacarıqlarını möhkəmləndirmək üçün nəzərdə tutulmuşdur. Biz bilirik ki, müəllimlər bu gün sinifdə bütün təhsilalanları ciddi şəkildə sınaqlara hazırlayırlar. Belə qərara gəlmək olar ki, təhsil bilik qazanmaqdan çox, sınaqlardan keçməkdir. Bu məqalənin əsas məqsədi tənqidi pedaqogika anlayışını, sinifdə tənqidi strategiyaların vacibliyini və bu təhsil üsullarının şagirdin bilik öyrənməsinə necə müsbət təsir göstərməsini öyrənməkdir. Sonda məqalə bunu göstərir ki, müəllimlər təhsilalanları tənqidi düşünmə bacarıqlarını inkişaf etdirmək, ədalətli bir cəmiyyət yaratmağa kömək etmək üçün sinifdə tənqidi pedaqogikadan istifadə etməlidirlər.

***Açar sözlər:*** *təhsil, tənqidi təfəkkür, təhsilalanlar, pedaqoji fikir, tənqidi strategiya*

**Nargiz Hasanova**
Xanaghal village secondary school named Aladdin Dadashov of Barda city
nergizhesenova1975@gmail.com

## The main quality indicator of critical pedagogy

**Abstract**

One of the most important goals of education in today's era is to develop the critical thinking skills of the students and at the same time to train well-rounded, thoughtful young people for the society. An important learning strategy of critical pedagogy is designed to strengthen learners' analysis, evaluation, and configuration skills. We know that today's teachers seriously prepare all students for tests in the classroom. It can be concluded that education is more about passing tests than gaining knowledge. The main purpose of this article is to study the concept of critical pedagogy, the importance of critical strategies in the classroom, and how these educational methods can positively affect student learning. Finally, the article suggests that teachers should use critical pedagogy in the classroom to help students develop critical thinking skills and create a just society.

***Keywords:*** *education, critical thinking, learners, pedagogical idea, critical strategy*

## Giriş

Tənqidi pedaqogika mədəniyyətşünaslıqda tənqidi nəzəriyyə və əlaqəli ənənələrdən anlayışlar işləyib tətbiq edən təhsil fəlsəfəsi və ictimai hərəkatdır. Tənqidi pedaqogikanın əsasını braziliyalılar qoymuşdur. Pedaqoqvə filosof Paulo Freire, 1968-ci ildə yazdığı "Məzlumların Pedaqogikası" adlı kitabında bunu göstərdi. Bundan sonra o, bütün dünyaya yayılaraq Birləşmiş Ştatlarda xüsusilə güclü baza yaratdı, burada tərəfdarlar irqçilik, cinsiyyətçilik və zülmlə mübarizə aparmaq üçün təlimdən istifadə vasitələrini inkişaf etdirməyə çalışdılar. Böyüdükcə insan haqları hərəkatı, vətəndaş hüquqları hərəkatı, əlillərin hüquqları hərəkatı, yerli hüquqlar hərəkatı, postmodern nəzəriyyə, feminist nəzəriyyə kimi sahələrdən elementləri özündə birləşdirdi (Freire, 2016).

Tənqidçilər bunun ali təhsil müəssisələri üçün uyğun olmadığını müdafiə edirdilər. Onlar təklif edirdilər ki, tənqidçi müəllimlər təhsilalanlara yazı kimi digər bacarıqları öyrətmək hesabına sinifdə siyasi perspektivlərin təbliğinə diqqət yetirsinlər.

Tənqidi nəzəriyyə kimi tənqidi pedaqogika sahəsi də inkişaf etməkdə davam edir. Peter McLaren kimi müasir tənqidçi pedaqoqlar öz tənqidlərində bir çox fərqli institutların və sosial strukturların, o cümlədən qloballaşma və media münasibətlərinin təsirini müzakirə edirlər. P.McLaren tənqidi pedaqogikanın sosial hərəkata əsaslanan versiyasını işləyib hazırladı və onu inqilabi tənqidi pedaqogika adlandırdı. Tənqidi pedaqogikanı kapitalizmə demokratik sosialist alternativi yaratmaq üçün sosial hərəkat kimi vurğuladı (Uddin, 2019: 109-119).

Nyu York şəhər universitetinin professoru İra Şor tənqidi pedaqogikanın sinifdə necə istifadə edildiyinə dair bir nümunə verir. O, gündəlik sinif həyatı, xüsusən də institusional şəraitdə "Freirean" tədris metodlarından istifadəni nəzərə alaraq bu mövzuları inkişaf etdirir. O, bütün sinif kurikulumlarına yenidən baxmağı və yenidən dizayn etməyi təklif edir. İra Şor şagirdin rolunun obyektdən aktiv, tənqidi subyektə çevrilməsinin tərəfdarıdır. Eyni zamanda, o, təhsilalanları özlərinə sahib olmaq hüququ uğrunda mübarizəyə dəvət edir. O, iddia edir ki, təhsilalanlar əvvəllər gündəlik həyat şəraiti ilə sakitləşirdilər və öyrənmə prosesləri vasitəsilə onlar özləri üçün yeni bir şey təsəvvür etməyə və buna can atmağa başlaya bilərlər. Əlbəttə ki, belə bir məqsədə nail olmaq asan deyil, çünki bu, müəllimin rolunun proses üçün vacib olduğunu güman edir. Müəllimlər şagirdlərə öz mövcudluq şərtlərinin qeyri-şərtsiz qəbulundan ayrılmağa kömək etməlidirlər. Bu ayrılığa nail olduqdan sonra təhsilalanlar gündəlik həyat imtahanına yenidən kritik girişə hazır ola bilərlər. Bu cür məqsədin əldə olunduğu sinifdə potensial nəticələrdən biri odur ki, təhsilalanlar özləri sinif üçün daha çox məsuliyyət daşıyırlar. Beləliklə, güc qruplar arasında bölüşdürülür və müəllimin rolu daha mürəkkəb olur. Bu, sadəcə olaraq professor üslubunu "təqlid etmək" əvəzinə, hər bir təhsilalanların intellektual xarakterinin inkişafına kömək edir (Lather, 2005: 487-497).

Bununla belə, müəllimlər şagirdmərkəzli sinifdə öz səlahiyyətlərini sadəcə olaraq tərk etmirlər. Yaşının sonrakı illərində Freire, işinin ciddi şəkildə səhv şərh edildiyinə inandığı şeylərdən getdikcə daha çox narahat oldu və müəllimlərin öz səlahiyyətlərini inkar edə bilməyəcəyini təkid etdi. Buna görə də, tənqidi müəllimlər öz nüfuzlarını tanımalı və sonra təhsilalanlara dəstək olmaq üçün öz hərəkətlərində bu səlahiyyəti nümayiş etdirməlidirlər. Müəllimlər həqiqəti çatdıranların səlahiyyətindən əl çəkirlər, təhsilalanların sorğu-sualına və problemlərin həllinə kömək edənlərin yetkin səlahiyyətlərini öz üzərinə götürürlər. Müəllimin bu cür nüfuzu ilə əlaqədar olaraq, təhsilalanlar azadlıq əldə edirlər, onlar müstəqil şəkildə öz biliklərini istehsal edə bilən bir vətəndaş olmaq imkanı əldə edirlər (Kaya, Kaya, 2017: 181-190).

Tədris tənqidi pedaqoq üçün mahiyyətcə siyasi akt hesab edildiyi üçün müəllim təhsilinin daha mühüm elementinə yəni, müəllimin şagirdin bacarıqlarını qavrayışına şüuraltı şəkildə təsir göstərə bilən gizli qərəzlərin aradan qaldırılmasına çevrilir.

Tənqidçi pedaqoqların nöqteyi-nəzərindən məktəb sosial transformasiya və emansipasiya mənbəyinə çevrilməlidir. Bu cür məktəblər dünyaya dəyişən kimi baxan fəal vətəndaşlar yetişdirməlidir.

Cəmiyyətin məqsədlərinə uyğun olaraq insanın formalaşması mexanizmlərini üzə çıxaran tənqidi pedaqoqlar tədrisin strukturu və üslubu, şagirdə görünməz təsir göstərən tapşırıq və nümunələrin seçilməsi kimi başa düşülən "gizli kurikulum" terminini elmi dövriyyəyə daxil etmişlər. Fransız filosofu və sosioloqu Pyer Burdye özünün "Təhsil, cəmiyyət və mədəniyyətdə reproduksiya" (1977) kitabında iddia edir ki, məktəbdə yüksək qiymətləndirilən biliklər mahiyyətcə burjua sinfinin biliyidir, bir növ obyektiv bilik deyil. Dərsliklər və kurikulumlar təkcə məlumatı deyil, həm də hakim siniflərin arzuladığı şifrələnmiş stereotipləri və üstünlükləri ehtiva edir (Bordovskaya, Rean, 2000).

McLaren tənqidi pedaqogikasını "inqilabçı" adlandırır. Onun fikrincə, kapitalın və onun dəyərli əmək formasının hökmranlığının sosial, iqtisadi və siyasi imkanları bağlamadığı gələcək uğrunda mübarizədə təhsil həlledici rol oynamalıdır. Postmodernizm qeyri-bərabərliyə və sosial həyatın bütün sahələrində kapitalın hökmranlığının dərinləşməsinə meydan oxuyan açıq və radikal perspektivlərin inkişafına maneədir. Alimin fikrincə, kapitalizmin bəyan etdiyi dar praqmatik dəyərlər bəşəriyyətin sağ qalmasının qlobal məqsədləri ilə kəskin ziddiyyət təşkil edir. Kapitalist iqtisadi sistemi mənfəət güdərək, insanlar üçün real dəyəri çox şübhəli olan getdikcə daha çox yeni

mallar yaratmaqla istehlakı stimullaşdırır. Bu illüziya dəyərləri isə bizim varlığımızın əsl məqsədini, yəni gələcək nəsillərin layiqli həyatını təmin etmək məqsədini kölgədə qoyur.

Bu gün tənqidi pedaqogikanın digər aktual aspekti təhsil sahəsində kompüter texnologiyalarının populyarlığının artması ilə bağlıdır. Xarici və yerli tədqiqatçılar təhsilin virtuallaşdırılmasının yaratdığı bir sıra problemləri müəyyən edirlər.

Braziliyanın Salvador şəhərində müxtəlif təhsil kontekstlərindən olan braziliyalı müəllimlərlə etnoqrafik tədqiqata əsaslanaraq, bu məqalə qlobal ingilis dili kontekstində tənqidi pedaqogika və dil təhsili arasında dialoq əlaqəsinə yanaşmaq və müzakirə etmək məqsədi daşıyır. Orijinal işin əsas məqsədi xarici dil kimi ingilis dili müəllimlərinin müasir dünyada özlərini dil peşəkarı kimi necə gördüklərini, ingilis dilinin beynəlxalq dil və ya qlobal dil kimi vəziyyəti ilə əlaqəli təsirlərdən nə dərəcədə xəbərdar olduqlarını araşdırmaq idi (Mahmoudi, Khoshnood, Babael, 2014: 86-92). Məlumatlar ingilis dilinin qloballığı, mədəni cəhətdən həssas tədris, mədəniyyətlərarası əlaqə və tənqidi pedaqogika kimi məsələləri müzakirə edən anketlər, sinifdə müşahidə sessiyaları və videolentə alınmış yarım-strukturlaşdırılmış qrup müsahibələri vasitəsilə toplanmışdır. Nəticələr göstərdi ki, iştirakçılar ingilis dilinin qlobal statusunun əhəmiyyətindən xəbərdardırlar və hazırkı dövrdə dilin tədrisi neytral və yaxud tənqidsiz şəkildə baş verə bilməz (Babanski, 2003).

Tənqidi pedaqogikada tənqidi düşüncə öyrənilə bilər və öyrənilməlidir. Bu məqsədlə mütəxəssislər proqramlar hazırlayır, ingilis, alman və digər dillərdə yüksək keyfiyyətli dərsliklər nəşr etdirirlər. Üstəlik, tənqidi təfəkkürün mənimsənilmə dərəcəsini yoxlamaq üçün müxtəlif üsullar yaradılmış, düzgünlüyü çoxsaylı empirik tədqiqatlarla təsdiq edilmişdir. Tənqidi düşüncənin üç səviyyəsi var:

1. başlanğıc
2. qabaqcıl
3. peşəkar.

Əgər insan tənqidi düşünməyi bacarırsa, arzulanan nəticənin əldə olunması ehtimalını artırmaq üçün müxtəlif idrak bacarıqları və strategiyalarından istifadə edir.

"Tənqidi təfəkkür" termininin müəllifi amerikalı filosof Con Dyuidir və o, bu düşüncəni aktiv, davamlı, hərtərəfli, informasiyanın bütün formalarına tətbiq olunan, əks etdirən və avtonom kimi təsvir edir. Tənqidi təfəkkür hər şeyi öz dəyəri ilə götürməyə deyil, məlumatları müstəqil təhlil etməyə və nəticə çıxarmağa imkan verir.

İnkişaf etmiş tənqidi təfəkkür uyğunsuzluqları görməyə və təsdiqlənməmiş məlumatları sorğulamağa kömək edir. Bu, yalnız alınan məlumatlara şübhə etmək istəyi deyil, düzgün sual vermək, cavabları təhlil etmək və qərar qəbul etmək bacarığıdır. Bu o deməkdir ki, tənqidi düşünən hər hansı bir fikri diqqətlə nəzərdən keçirir. Başqasının fikrinə güvənməkdənsə, öz araşdırmasını aparır. Fikirlərinə də diqqət yetirir və onların nə qədər məntiqli, əsaslı və qərəzsiz olduğunu yoxlayır.

Tənqidi təfəkkürün öyrənilməsində hələ də həll olunmamış bəzi problemlər var. Hansı psixoloji mexanizmlər tənqidi düşüncənin etibarlı fəaliyyətinə zəmanət verir?

Bu mövzuda az araşdırma var, lakin Lev Vyqotsky psixikanın tərifinə görə qərəzli və subyektin həyat tərzinə uyğun olduğunu vurğuladı; o, reallığı analiz etmək və dəyişdirmək üçün nəzərdə tutulmuşdur ki, subyekt dünyada daha effektiv hərəkət edə bilsin.

Tənqidi təfəkkürün inkişafı texnologiyasında suallarla işləmək bacarığını formalaşdıran texnikalara böyük əhəmiyyət verilir. Ənənəvi tədris təhsilalanlara təqdim edilən hazır cavablara əsaslandığı halda, tənqidi təfəkkürün inkişafı texnologiyası suallara yönəlib, cavab axtarışı zehni fəaliyyəti inkişaf etdirir.

"Tənqidi" sözü qiymətləndirici komponenti nəzərdə tutur. Qiymətləndirmə həm müsbət, həm də mənfi münasibətlərin konstruktiv ifadəsi ola bilər. Biz tənqidi düşünəndə düşüncə proseslərimizin nəticələrini, verdiyimiz qərarın nə dərəcədə düzgün olduğunu və tapşırığı nə qədər uğurla yerinə yetirdiyimizi qiymətləndiririk. Tənqidi təfəkkür həm də düşüncə prosesini qiymətləndirməyi əhatə edir, nəticələrə səbəb olan əsaslandırma və qərar qəbul edərkən nəzərə aldığımız amillər istənilən nəticəni əldə etməyə yönəldiyi üçün tənqidi təfəkkür bəzən ***yönləndirilmiş təfəkkür*** də adlanır.

Məncə, tənqidi düşünmə milyonlarla rəyin hökm sürdüyü dünyada bir insana lazım olan əsas bacarıqlardan biridir. Tənqidi düşüncə öz hərəkətlərinizi dəqiq şəkildə qiymətləndirməyə, həm nailiyyətlərinizdən, həm də səhvlərinizdən nəticə çıxarmağa kömək edir.

Tənqidi düşüncə analitik düşüncədən nə ilə fərqlənir. Analitika məlumatı parçalara ayırır və onları daha yaxşı başa düşməyə imkan verən şəkildə yenidən birləşdirməyə çalışır. Tənqid isə, ilk növbədə, şübhədir, yəni analitik düşüncənin köməyi ilə məntiqi səhvlər, yalanlar və manipulyasiyalar axtarmaq. Məsələn, bir analitik kimi bir məqalə oxuyursansa, o zaman mətni kiçik abzaslara böləcəksən, ardıcıl olaraq onların məzmunu ilə tanış olacaqsan və sonra özünə "Oxuduqlarından hansı nəticə çıxır?" sualını verəcəksən. Əgər siz bir tənqidçi kimi məqalə oxuyursunuzsa, o zaman ilk növbədə məqalənin müəllifinin kim olması, müəllifin fikrinin harada olması və faktların harada olması, bu faktların haradan qaynaqlanması və onların mənbələrinin nə dərəcədə etibarlı olması ilə maraqlanacaqsınız (Vulfov, İvanov, 2000).

Tənqidi düşüncə sağlam düşüncədən nə ilə fərqlənir? Sağlam düşüncə həqiqət axtarışı ilə bağlı deyil. Bunlar cəmiyyət tərəfindən paylaşılan həyati baxışlardır. Yəni sağlam düşüncə insanların müəyyən bir zamanda və konkret yerdə necə düzgün yaşamaq sualının müəyyən bir cavabıdır. Bəzən reallığı adekvat şəkildə əks etdirir, lakin həmişə deyil.

"Yanılmaların anatomiyası" kitabının müəllifi Nikita Nepryaxinin yazdığı kimi, sağlam düşüncənin ən sadə nümunəsi atalar sözləri və məsəllərdir. Halbuki, xalq hikməti daima bir-birini təkzib edir: "Gününü Allah verdi, ruzi də verər", amma "Allaha təvəkkül et, özün səhv etmə"; "Daha sadə olun, insanlar sizə tərəf çəkiləcək" və "Sadəlik oğurluqdan da pisdir". Tənqidi düşünən insan üçün belə uyğunsuzluq o deməkdir ki, ideya təcili olaraq sınaqdan keçirilməlidir (Mahmoudi, Khoshnood, Babael, 2014: 87).

Sağlam düşüncə tənqidi düşüncənin mübarizə apardığı şeydir. Məlumat təkrarlananda, sadəcə beyin onunla çox tanış olduğu üçün insanlara doğru görünməyə başlayır.

***Tənqidi düşünmək nə üçün vacibdir?***

Beyin elə qurulub ki, tez-tez səhvlər edir. Psixoloq və iqtisadiyyat üzrə Nobel mükafatı laureatı Daniel Kahnemanın izah etdiyi kimi, bədənimizin əsas orqanı düşünməyə mümkün qədər az səy sərf etməyə çalışır. Nəticə etibarı ilə biz qərarların çoxunu düşünmədən tez qəbul edirik. Məsələn, biz buna öyrəşdiyimiz üçün evdən çıxmazdan əvvəl qapını bağlayırıq. Bu səy iqtisadiyyatı məntiqlidir: bütün hərəkətlərimizi düşünsək, həqiqətən vacib olan şeylər üçün nə vaxt, nə də idrak resursları olardı. Yeganə problem beynin cəld qərarlar strategiyasından hətta ciddi düşünməyə ehtiyac duyulan yerlərdə də istifadə edə bilməsidir.

***Niyə tənqidi düşünməyi bacarmaq lazımdır?***

Bizə hər yerdə tənqidi yanaşma lazımdır. Əsassız olmamaq üçün onun praktik faydalarına bir neçə nümunə verək:

Peşəkar və gündəlik həyatda tənqidi təfəkkür daha dəqiqdüşünməyə və işləməyə, nəyin vacib və əhəmiyyətsiz olduğunu tez müəyyənləşdirməyə, problemləri daha effektiv həll etməyə, müxtəlif tapşırıqların öhdəsindən daha diqqətli və səmərəli şəkildə gəlməyə kömək edir.Tənqidi təfəkkürün inkişafı ilə yanaşı öyrənmə zamanı siz arqumentləri tez dərk etmək, mətnlərdəki əsas fikirləri tez müəyyən etmək, ekspert və mütəxəssislərin sübut və ifadələrindən istifadə etmək, tənqidi və analitik materialları digərlərindən fərqləndirmək bacarıqlarını inkişaf etdirəcəksiniz.

Şəxsi sahədə tənqidi təfəkkür başqalarının mühakimələrini, baxışlarını, sübutlarını və fikirlərini tez təhlil etməyi, sözlərinizi bacarıqla əsaslandırmağı və razı olmadığınız şeyləri əsaslandıraraq mübahisə etməyi, başqalarının və öz inanclarınızı, düşüncələrinizi daha yaxşı başa düşməyi öyrədəcəkdir.

***Tənqidi düşüncənin formalaşması***

Müasir cəmiyyətdə bir insan başqalarının fikirlərinin daimi təzyiqi altındadır. Tənqidi düşüncə tərzini inkişaf etdirməyin ən təsirli yollarından biri media, reklam və s. tərəfindən yayılan məlumatlara mümkün qədər tənqidi yanaşmağa başlamaqdır. İnsanların aldıqları məlumatların hamısı doğru deyil. Həqiqətlə yalanı ayırd etməli və bunun üçün hər kəsin sözünü qəbul etməlisən.

boyunca o sahələrdə çalışan insanların danışığında, nitqində istifadə olunur və nəsildən-nəslə ötürülür.

4. Terminlər dilin inkişafında və zənginləşməsində əsas rola malikdir. Ümumiyyətlə, müasir dövrdə dildə yaranan sözlər arasında terminlər çoxluq təşkil edir. Leksikanın ən çox idarə edilə bilən hissəsi terminologiyadır. Bir sözlə, terminlərin meydana gəlməsini və işlədilməsini izləmək mümkündür. Müxtəlif elm sahələrinin terminologiyasının yaradılması yalnız tətbiqi mahiyyətə mənsub deyil, bununla yanaşı, cəmiyyətdə terminoloji praktika mübadiləsinin şərtlərinə, dil vasitələrinin məharətlə idarə edilə bilən tərzdə uyğunlaşdırılmasına qarşı maraqlı nümunələrdəndir. Müasir dövrdə bütün dillərin terminologiyasına qurumlar tərəfindən xüsusi nəzarət edilir. Beləliklə, bu kimi xüsusi qurumlar terminologiyanın standartlaşması ilə məşğul olurlar. Azərbaycan dilində terminologiyaya nəzarətin nəticəsinə nümunə kimi sait və samit terminlərinin səsli və səssiz terminləri ilə əvəz olunması, daha sonra isə, səsli və səssiz terminlərindən sait və samit terminləri ilə əvəz olunmasını göstərmək olar.

5. Professional sözlər ilə terminlər arasında genetik xüsusiyyətlərə görə müəyyən fərqlər mövcuddur. Əksər professional sözlərin aid olduğu leksika türk mənşəlidir və türk xalqının maddi və mənəvi mədəniyyəti, həyat tərzi, məişəti ilə əlaqəli anlayışları bildirir. Terminlər isə əksinə elm və texnika ilə bağlı sözləri, anlayışları ifadə edir. Terminoloji leksikanın daxilində türk mənşəli terminlərlə yanaşı, alınma sözlər də çoxluq təşkil edir. Məhz bu alınma terminlərin hansı dilə mənsubluğu da qeyd edilən iki leksik təbəqənin bir-birindən fərqləndirilməsinə səbəb olur. Peşə-sənət leksikasıa daxil olan alınma sözlərin əksəriyyəti ərəb-fars mənşəlidir, lakin alınma terminlərin bir hissəsi Qərbi Avropa mənşəlidir. Beynəlmiləl terminlərin terminologiyada xüsusi fərqləndirilməsi vacib məqamlardandır (Reformatskiy, 1968: 167).

6. Peşə-sənət leksikası ilə terminlər arasında başqa fərq odur ki, professional sözün mənası tək izah edilirsə, başqa sözlə, danışanların sözdən həqiqi şəkildə istifadə etməsinə əsaslanaraq sözün mənası aşkar olunarsa, terminin mənası təyin edilməlidir. Fikri daha sadə yolla izah etsək, terminlər yalnız anlayışı ifadə etmir, həmçinin anlayışın müəyyən olunması əsasında meydana çıxır. Akademik V.Vinoqradov bu fikrə münasibət bildirir: “Məlumdur ki, söz hər şeydən əvvəl nominativ, yaxud definitiv funksiya yerinə yetirir, yəni ya dəqiq ifadənin (bu zaman o, adi işarədir), ya da məntiqi təyinatın vasitəsi olur (bu zaman o, elmi termindir)” (Vinoqradov, 1975: 16).

V.Vinoqradov bu fikri ilə vurğulamaq istəyir ki, terminə görə definisiyanın olması əsas faktordur. Buradan aydın olur ki, terminlər üçün definisiyanın mövcud olması zəruridir. Terminin definisiyası ilə bağlı bir çox müəlliflər dəyərli fikirlər söyləmişlər. Onlardan biri də T.L.Kandelakidir: “Mütəxəssislərin sərəncamında terminləşdirilən anlayışın yazılı və ya şifahi şəkildə şərh edilən məzmunu olur. Definisiyada adlandırılan obyektin əhəmiyyətli əlamətlərinin toplusu əksini tapır. Bu əlamətlər içərisindən zəruri və kafi alamətlər seçilir. Onlar ən yaxşı (ideal) halda terminin səs cildində da ifadəsini tapır” (Kandelaki, 1977: 8). Deməк, peşə-sənət leksikası ilə terminləri bir-birindən fərqləndirən əsas cəhətlərdən biri də terminlərin definisiyasının olmasıdır.

7. Terminoloji leksikada arxaizm və tarixizmlərə rast gəlinmir. Professional sözlər sırasında isə keçmişdə Azərbaycan ədəbi dilində istifadə edilmiş, lakin müasir azərbaycan dilində işlədilməyən, istifadədən çıxmış bir çox sözlər məhdud sahədə işlənməkdədir. Peşə-sənət leksikası mühafizəkar təbiəti ilə seçilir. Buna görə də arxaizmlər peşə-sənət leksikasında mövcuddur. Xalçaçılıq leksikasında olan naxış kimi istifadə olunan küpə, tənə “sırğa”, sığır “inək”, piti “yazı”, pitik “məktub”, “kitab” sözlərini misal çəkmək olar.

8. İngilis və azərbaycan dillərində terminlə professional sözlərin fərqlərindən biri terminlərin ədəbi dilə məxsusluğudur. Peşə-sənət leksikası yalnız ədəbi dil faktı olmaması ilə terminlərdən fərqlənir. Bu sözlərin bir qismi məhəlli, yəni lokal səciyyə daşıyır. Terminlərdə isə bu xüsusiyyətə rast gəlinmir. Məsələn, dulusçuluğa aid badya, bardaq, dibçək, qəlib, çanaq, kürə, kül, ox, parç, odluq, sac, sürahi kimi sözləri ədəbi dilə (sürahi tipli sözləri, hətta poetik üsluba) aid etmək mümkündürsə, bərə “Ərkivanda dulus peçini qalamaq üçün oyuq”, qazanc “dulus bıçağı”, ləngəri “süd sərmək üçün dərin saxsı qab”, faşır “yuyunmaq üçün saxsı ləyən” sözlərini ədəbi dil faktı kimi

saymaq qeyri-mümkündür. Eyni ifadəni professional sözlərin başqa məna qrupları haqqında da demək olar.

9. Terminlərin sinonimliyi yolverilməzdir, çünki terminologiyada sinonimlər xüsusi bir rola malik deyil, hətta elm və texnologiyanın müxtəlif sahələrində anlaşılmazlığa səbəb olur. Daha uyğun olan terminlərin standartlaşma mərhələsində seçilir, başqa seçimlər və dubletlər standartdan uzaqlaşdırılır. Z.N.Verdiyeva öz müddəasında bildirir ki, terminoloji təbəqəyə nəzarət edilərkən sinonimlərin bütövlükdələğv edilməsinə yox, məhdudlaşdırılması üçün vuruşmağa ehtiyac var. O yazır: "sinonim terminlərin elmi şərhinin yeknəsəqliyinin qarşısını alır" (Verdiyeva, 1988: 70).

Bu sözlər, yəni sinonimlər eyni nitq hissəsinə mənsub və mənaca bir-birinə çox yaxın olduğuna görə onları cümlədə doğru şəkildə işlətmək üçün sinonimləri fərqləndirən semantik və üslubi xüsusiyyətləri bilmək zərurəti yaranır. Professional sözlər arasında sinonimlik mövcuddur və geniş yayılmışdır. Buradan aydın olur ki, bu xüsusiyyət peşə-sənət leksikasının ən qabaqcıl əlamətlərindən biridir.

10. Qeyd etdiyimiz kimi, obrazlılıq, emosionallıq, metaforiklik kimi əlamətlər terminlərə xas deyil. Lakin peşə-sənət leksikasında emosionallığa az da olsa, rast gəlmək mümkündür. Xalçaçılıqda naxış adı altında istifadə olunan tazıqaçışı, pişikqıynağı, keçidabanı, saqqaldarağı, ilanəyrisi, parça adı kimi işlənən alışdım-yandım, hacımənəbax sözlərində qismən metaforiklik vardır.

11. Peşə-sənət leksikası və terminoloji leksika arasındakı növbəti mühüm fərq ondan ibarətdir ki, professional sözlər, əsasən, müəyyən peşə adamlarının danışıq nitqinə uyğun gəlir, bəzən xüsusi adların bir növ qeyri-rəsmi sinonimi olur. Çox vaxt onlar lüğətlərdə əks olunur, lakin həmişə "professionalizm" kimi qeyd olunur. Məsələn, qəzet və jurnalların redaksiyalarında illüstrasiya seçimi ilə məşğul olan mütəxəssisə "build editor", yəni tikinti redaktoru deyilir. "Build editor" bir termindir. Bununla belə, real istehsal prosesində qısaltma üçün istinad edilir. "Bildom" professional sözdür. "Bild trampled all the photos on the layout" - şübhəsiz ki, bu cümlədə professional sözdən istifadə edilir, lakin terminlər deyil, zəifləmiş terminlər çox vaxt professionalizmə çevrilir: Build editor - bild, calipers (xüsusi ölçü xətkeşi), barbell və s.

İngilis dili ilə müqayisədə Azərbaycan dilinin peşə-sənət leksikası xalqın maddi və mənəvi həyatını özündə cəmləşdirir. Bu sözlər həm «peşə-sənət sözləri», həm də «peşə-sənət leksikası» adlandırıla bilər. Peşə-sənət sözləri qədim Azərbaycanın el sənətlərinin dilində çox işləndiyinə görə, bu sözlər şifahi şəkildə dildən-dilə keçmiş, müəyyən az savadlı adamlar ətrafında işlədilən leksik vahidlər olmuşdur. Peşə-sənət leksikasi, adətən, qədim türk sözləri hesabına yaranır və formalaşır. S.Cəfərov qeyd edir: "...peşə-sənət leksikasının terminoloji leksika ilə çox yaxınlığı vardır. Bununla belə, bu iki sahə leksikasını eyniləşdirmək olmaz".

## Nəticə

Professional sözlərin və terminlərin dilçilik elmində xüsusi yerləri var. Professionalizm və terminlər Azərbaycan və ingilis dilləri daxil olmaqla, dünyanın əksər dillərində geniş istifadə olunur. Dünyanın bütün inkişaf etmiş dillərində bu sözlər dilin leksik sistemində əhəmiyyətli yerlərdən birini tutur.

Professional sözlər ilə terminlər arasında bir sıra ümumi və fərqli cəhətləri vardır. Bu sözlər terminlərdən fərqli olaraq emosional və ekspressivlik cəhətinə malik olur. Professional sözlərin növləri maarifləndirmə və dəyişiklik məqsədi ilə geniş ictimaiyyətə çatdırılır. Professionalizmi müzakirə edərkən yazıçının professional sözlərdən necə və niyə istifadə etdiyi önəmlidir.

Dildə terminlər və professional sözlərin sayı getdikcə artır, bu sahənin bazası sürətlə zənginləşir.

## Ədəbiyyat

1. Blumfild, L. (2014). Dil. Bakı: Prestij, 520 s.
2. Kazımov, Q.Ş. (2000). Müasir Azərbaycan dili. Sintaksis. Bakı: Ünsiyyət, 496 s.
3. Galperin, I.R. (1981). Stylistics, 295 p.
4. Arnold, I.V. (1972). The English word. M., 294 p.

5. Akhmanov, O.S. (1957). Ocherki po obshey i russkoy leksikologii. M.: Uchpedgiz, 295 c.
6. Hajiyeva, A. (2011). English Lexicology. Baku: Science and Education, 248 p.
7. Biyaliev, A. (1972). Kirgizskie narodnie termini promislovoy oxoti: avtoref. Dis kand. filol.nauk. Fnrunze, 26 s.
8. İbrahimov, F. (1988). Azərbaycanın orta əsr şəhərlərində metalişləmə sənəti (IX-XIII əsrlər). Bakı: Elm, 176 s.
9. Reformatskiy, A.A. (1968). Misli o terminologii. Sovremennie problemi russkoy terminologii. M: Nauka, 199 s.
10. Vinoqradov, V.V. (1975). Russkiy yazik (grammaticheskoe uchenie o slove). M: Visshaya shkola, 614 s.
11. Kandelaki, T.L. (1977). Semantika i motivirovannost terminov. M: Nauka, 168 s.
12. Verdiyeva, Z.N. (1988). Terminologiyada sinonimlik məsələsi. Bakı: APİ-nin nəşri, 71 s.

Göndərilib: 12.08.2023 Qəbul edilib: 24.09.2023

DOI: https://doi.org/10.36719/2663-4619/95/100-106

**Arəstə Xudiyeva**
AMEA Folklor İnstitutu
lalka81@live.co.uk

# AZƏRBAYCAN DASTANLARINDA ANTROPONİMLƏRİN MÖVZU DAİRƏSİ VƏ FOLKLOR SEMANTİKASI

**Xülasə**

Məqalədə Azərbaycan xalq dastanlarındakı antroponimlər tematik qruplar üzrə təsnif edilir, bu adların ritual-mifoloji, dini (sufi) semantikası və magik funksiyası öyrənilir. Şəxs adlarının insan-təbiət, fərd-toplum, özünkü-yad, sakral-profan və s. münasibətlər zəminində eposdakı funksiyası nəzərdən keçirilir. Personajların mənfi və ya müsbət xarakterini bəlli edən epitetlər də xalqın dünyagörüşü, inamları, ənənəvi həyat tərzi və mədəniyyəti kontekstində diqqətə alınır. Tarixin axarında qəhrəmanlıq dastanlarının yerinə məhəbbət dastanlarının populyarlıq qazanması ilə Azərbaycan dastan antroponomikasının dəyişməsi və bu dəyişməyə səbəb olan amillər tədqiq olunur. Azərbaycan məhəbbət dastanlarının yaradıcısı və ifaçısı olan aşıqların islam dini-mistik ordenlərinə bağlantısının epik qəhrəman tipinin müəyyənləşməsində rolu və bunun şəxs adları səviyyəsində təzahürü araşdırılır.

***Açar sözlər:*** *Azərbaycan folkloru, Azərbaycan dastanları, Azərbaycan antroponimləri, Kitabi-Dədə Qorqud, epik şəxs adları*

**Aresta Khudiyeva**
ANAS Institute of Folklore
lalka81@live.co.uk

## Subject scope and folklore semantics of anthroponym in Azerbaijan epic

**Abstract**

In this article, a comprehensive analysis is presented where the anthroponyms found in Azerbaijani folk tales are meticulously classified into various thematic groups. The research delves into the intricate study of the ritual-mythological and religious (Sufi) semantics, as well as the magical function that these names possess. The investigation further explores the multifaceted nature of personal names, examining their relation to human-nature, individual-community dynamics, as well as their significance in distinguishing between the realms of own and alien, sacral and profane. Additionally, the article delves into the examination of the function of these names within the context of the epic narratives, illuminating their role in shaping the interconnections between characters. Moreover, the article recognizes the importance of epithets in reflecting the dichotomy of negative and positive character traits, taking into account the people's outlook, beliefs, traditional lifestyle, and culture.

Furthermore, this research endeavors to trace the historical evolution of Azerbaijani epics, particularly the transition from heroic epics to love epics. Through an in-depth analysis, the article aims to shed light on the changes that occurred in the anthroponomics of Azerbaijani epics and the underlying factors that brought about this transformation. Notably, the study explores the pivotal role of Ashiqs, who are both the creators and performers of Azerbaijani love sagas, in shaping the archetypal hero within these narratives. The investigation extends beyond the realm of storytelling, scrutinizing the manifestation of this influence at the level of personal names. By meticulously examining the etymology and connotations of these names, the research seeks to unravel the intricate web of cultural and literary influences that have shaped the epic tradition of Azerbaijan.

***Keywords:*** *Azerbaijani folklore, Azerbaijani epics, Azerbaijani anthroponyms, Kitabi-Dade Gorgud, epic personal names*

## Giriş

**Məsələnin qoyuluşu**. Xüsusi adlar, əsasən də antroponimlər, toponim və teonimlərlə yanaşı folklor mətninin strukturunda xüsusi yerə malikdirlər. Folklor qəhrəmanlarının (eləcə də antiqəhrəman) adlarında qəhrəmanın (eləcə də antiqəhrəmanın) özü – onun mənşəyi, xasiyyəti, fəaliyyəti, görünüşü və s. ilə yanaşı, onunla bağlı folklor nümunəsini yaradan xalqın həyat baxışları, dünyadərki, tarixi və mədəniyyəti haqqında məlumat əks oluna bilir. Bu da göstərir ki, ad bir personajın markeri olmayıb, sosial-mədəni əhəmiyyət kəsb edir.

**İşin məqsədi.** Azərbaycan dastanlarında antroponimlər həm say etibarilə, həm də tematikasına və quruluşuna görə digər xüsusi adlardan seçilir. Lakin onların, demək olar ki, hamısı süjetin və ya obrazın funksional semantikası ilə bu və ya digər şəkildə bağlıdırlar.

Azərbaycan şəxs adları ümumiyyətlə tematik baxımdan rəngarəndir. Bu mövzuda tədqiqat aparmış F.Qurbanova yazır ki, antroponimlərin leksik-semantik analizi gəstərir ki, oğuz qrupu türk dillərində şəxs adlarının yaranmasında 50-dən artıq söz qrupu iştirak edir ki, onlardan ən qədimi və ən produktiv olanları etnonim, toponim, hidronim, zoonim, fitonimr, kosmonim, teonim və başqa söz qruplarıdır (Kurbanova, 1998: 26).

Azərbaycan epik mətnlərində, daha doğrusu dastanlarında isə şəxs adlarının analizini aparsaq, onları aşağıdakı tematik qruplar üzrə təsnif edə bilərik:

1) Obrazın mənəvi-psixoloji xarakteri ilə bağlı adlar. İstər Azərbaycan qəhrəmanlıq dastanlarında, istərsə də məhəbbət dastanlarında tez-tez rastlanılır (“Kitabi-Dədə Qorqud”da Yalançı oğlu Yalancıq, “Koroğlu”da Tanrıtanımaz, “Leyli və Məcnun”da Məcnun, və s.).

Xalqın qəhrəmanlıq keyfiyyəti hesab etdiyi, qəhrəmanlığın meyarlarını ifadə edən adları təbii ki, müsbət personajlar daşıyır. Epik yaradıcılığın düşmənə, şər qüvvələrə şamil etdiyi axmaqlıq, hərislik, yalançılıq kimi sifətlərin ad şəklində epik mətndə mənfi ibrazların adında xüsusiləşir. Məsələn, “Kitabi-Dədə Qorqud”da bu hal Yalançı oğlu Yalınçıq adında bariz təzahür edir. Belə adlar, obrazın mənəvi-psixoloji xarakterini nəzərə çarpdırılmaqla yanaşı, onun istənilən situasiyada hərəkətinin “qanunauyğunluğuna” işarə edir.

2) Obrazın etnik-milli və ya dini kimliyi ilə bağlı olan adlar (“Koroğlu”da Ərəb Reyhan, Firəngoğlu, “Şah İsmayıl”da Ərəb Zəngi, “Kitabi-Dədə Qorqud”da Qıpcaq Məlik və b.). Əsasən, başqa ölkənin və ya başqa xalqın nümayəndələri dastanlarda bu tip adlar daşıyırlar.

3) Obrazın sosial mənşəyi, sosial statusu ilə bağlı olan adlar (“Əsli və Kərəm” dastanında Qara Keşiş, “Koroğlu”da Giziroğlu, Dəmirçioğlu və b.). Çox vaxt Azərbaycan dastanlarında çoxkomponentli adların tərkib hissəsi kimi çıxış edirlər: Dəmirçioğlu Dəli Həsən, Giziroğlu Mustafa bəy.

4) Obrazın fiziki gücü və ya fiziki xarakteri ilə bağlı adlar (“Kitabi-Dədə Qorqud” da Dönəbilməz Dölək Uran, Arşın oğlu Dirək, “Koroğlu”da Tüpdağıdan, Toxmaqvuran, Halaypozan (əslində Alaypozan), Keçəl Həmzə, “Əsli-Kərəm”də Əsli (Əsli sulu, dolu bədənli, gözəl mənasındadır) və s.). Azərbaycan folklorunda mənfi obrazlarların və ya triksterlərin adında ən çox Qara və Keçəl komponentləri iştirak edir. Eyni zamanda demək lazımdır ki, Keçəl epiteti daşıyan qəhrəman, bu təyinin aid olunduğu adla məşhur digər folklor qəhrəmana tam zidd (və ya zidd gedən) olan obrazı bildirir. Məsələn, Azərbaycan nağılı “Göycək Fatma”da mənfi xarakterli Keçəl Fatma, eyni adlı müsbət xarakterli baçısının tam əksi – antipodudur. Bubunla bərabər, Keçəl Fatma, həm islamda, həm də ondan qaynaqlı Azərbaycan folklor mətnlərində Məhəmməd peygəmbərin qızı, saflıq, paklıq, müqəddəs ana rəmzi olan Həzrəti Fatimə obrazına əksdir. Bu hal eyni şəkildə özünü “Koroğlu” dastanındakı Keçəl Həmzə obrazında göstərmişdir. Həmzə Şərq dini məzmunlu yazılı dastanlarından olan “Həmzənamə”nin qəhrəmanıdır. İslam tarixində Həmzə Məhəmməd peyğəmbərin sevimli əmisi və ilk müsəlmanlardan sayılır. Həmzənin İslam mənbələrində bir qəhrəman obrazı vardı və bu səbəbdən də ləğəbi “Əsədullah” (Allahın şiri) idi. Həmin dastanda Əmir Həmzənin bir güclü pəhləvan kimi İshaq Nəbinin tilsim edilmiş atının oğurlayıb aparması təsvir olunub. Lakin burada, “Koroğlu”nun Cənubi Azərbaycan tədqiqatçısı Bəhruz Həqqinin yazdığı kimi, Həmzə Koroğlu kimi qəhrəmanlara xas əxlaqa və qeyri-adi gücə mailk təsvir olunur (Həqqi, 2003: 231). O, heç yerdə qorxaq, xəyanətkar, yalnız özünü düşünən xudbin kimi verilmir.

Beləliklə, "Koroğlu"da Keçəl Həmzə "həqiqi Həmzənin" antipodu, əksidir və əkslik keçəl epitetində ifadə olunub.

5) Heyvan tematikasına daxil adlar ("Kitabi-Dədə Qorqud"da Qorqud, Bəybörə, Basat, Buğac, Bəybecan, "Koroğlu"nun Paris nüsxəsində Bürçü, "Müğüm şah"da Aslan şah və b.).

Bunlar, göründüyü kimi, əsasən, qurd, aslan və öküz mənalı adlardır. Azərbaycan (oğuz) eposlarındakı Qorqud, Baybörə adları qurd ("börü"), Oğuz, Buğac adları isə öküz kultuna bağlanılır. "Koroğlu" dastanında (dastanın Paris nüsxəsində) Osmanlı padşahı Sultan Muradın oğlu (Koroğlunun həyat yoldaşı Nigarın qardaşı) Bürcü adını daşıyır (Abbaslı, 1997: 69-71). Bürcü (börücük/bürcük/bülcək) sözü də qədim türk dilində "qurd balası" anlamı verir (Əbu Həyyan Əl-Əndəlusi, 1995: 27).

"Oğuz kağan" dastanının qəhrəmanı Oğuzun buynuzlu təsəvvür edildiyi qeyd olunur (Bayat, 1993: 35). Oğuz adının bir mənası "öküz" deməkdir. Həmin dastanın uyğur əlyazmasında ilk səhifədə bir buynuzlu heyvan təsviri var ki, o da buğa təsviri sayılır və Oğuzun atası hesab edilir. Tarixi-arxeoloji faktlar göstərir ki, türk və monqol-mancur xalqlarının öküz, sığın və maralla bağlı min illər əvvəl yaranmış və geniş yayılmış mifləri vardı. "Buğa" digər Altay ailəsi dillərində, məsələn monqolca maral, evenkcə sığın deməkdir. Buynuzun isə bir-çox dillərdə məcazi mənada "silah", "güç", "iddia", "var-dövlət" və s. mənalar mövcuddur. Məsələn V.İ.Dalın rus dilinin izahlı lüğətində verdiyi izahda buynuzun rusca çoxsaylı mənaları içərisində deyilən mənaları da göstərilir: "Рог, сила, крепость, власть, могущество; киченье, надменность. Не даша рога грешнику, Маккв. Сбить с кого рога, смирить. Рогом стереть, силою, властью" (3). İngilis poetik mətn-lərində də buynuz – "horn" silah, hakimiyyət, yüksəliş kimi məcazi mənalar kəsb edir.

Bahəddin Ögəl, Ağaverdi Xəlil kimi tədqiqatçılar, oğuz mərasim kompleksindən danışarkən Çin mənbəsində 450-ci ilə aid aşağıdakı məlumatı xatırladırlar: "Onlar ölülərini atları və silahları ilə birlikdə dəfn edirlər. Qadınları bəzək olaraq buynuz və sümükdən hazırlanmış papaqlar, yəni "boqtak"lar geyinirlər" (Xəlil, 2016: 80). Qədim türklərin Umay ilahəsinin rast gəlinən təsvirlərində bu ilahənin də buynuzlu təsəvvür edildiyinin şahidi oluruq.

Azərbaycan folklorunda, eləcə də dastanlarda ("Aşıq Bəhmənlə Humay xanım", "Aşıq Şakirlə Ceyran xanım" və b.) Humay, Ceyran, Maral kimi qadın obrazların adları heyvan tematikasına aid olsalar da, insana bu adların verilməsində həmin heyvanların nəcibliyi və gözəlliyi ilə yanaşı, ənənədə sakral kultlarla bağlı olması da mühüm rol oynamışdır. Türk xalqlarının, o cümlədən Azərbaycan dastanlarında maral və ceyranlar sakral məkanlarla bağlanır. "Şah İsmayıl" dastanında Şah İsmayıl "ipəkdən culu olan, culundn qızıl qumrovlar asılan" sirli ceyranla güllü-çiçəkli uca dağ belində rastlaşır (Azərbaycan dastanları, 2005: 209). Digər yandan, maral və ya ceyran ibadət-gahlarda tanrılara qurban edilən sakral heyvan ola bilərdi. Bilirik ki, ibtidai mədəniyyətlərdə qurban edilmiş heyvanların dərisini, sümüklərini, xüsusən hansısa əlamətdar sümüyünü (diş, kəllə, buynuz və s.) saxlamaq adət idi. Azərbaycan folklorunda maralın sakral hevan kimi müqəddəs şəxslər və müqəddəs yerlərlə, ocaqlar və pirlərlə bağlantısı haqqında çoxsaylı rəvayətlər mövcuddur. Bu xüsusda Qarabağ bölgəsində müqəddəs Hacı Qaraman babanın maral üstündə gəzməsi, onun evinin qapısına maraların sağıma gəlməsi barədə indi də xalq arasında yaşayan və danışılan rəvayətləri xatırlamaq olar (Qarabağ: folklor da bir tarixdir, 2012: 54-56).

"Oğuz kağan" dastanında da Oğuz xan oğuzlara zülm edən insanları yeyən nəhəng Kıatı zərərsizləşdirmək üçün onun gəldiyi yerə qarşı birinci maral, sonra ayı bağlayır. Görünür, burada da həmin heyvanların şərə qalib gəlmək və ya onu zərərsizləşdirmək kimi mifoloji inamları əks olunmuşdur.

Sibirin qədim qayaüsyü təsvirlərində səma maralının təqibi tez-tez rastlanılır. Bir sıra Sibir xalqlarında təbiətin oyanmasını, yenidən dirilməsini ifadə edən ritualda müqəddəs maral "öldürülür" və sehrli şəkildə "yenidən dirililirdi". Əfsanəyə görə Çingiz xanın ulu nənəsi Alan-qoa (Ala maral) idi. Evenklər ümumiyyətlə kosmosu nəhəng maral şəklində təsəvvür edirilər. Bu səbəbdən onların dilidə "Buqa" həm erkək maral, həm də kosmos anlamına gəlirdi. "Buqu" sözü bir-çox türk dillərində də maral deməkdir. "Kitabi-Dədə Qorqud"da Bayındır xanın meydanında xüsusi bəslənmiş buğa ilə buğranın döyüşdürülməsi epizodu da qəqin ki, mövsümü ritualların

mətndə qorunan təzahürlərindəndir. Buğacın zəncirlərini qıran buğanı ram etməsi, kosmik nizamın bərpasının ritual təzahürü kimi yozula bilər.

6) İslam dini mövzulu adlar (Azərbaycan dastan və nağıllarında geniş rastlanan Məmməd (Məlikməmməd), Əhməd, Əli, Həsən, Hüseyn adları, "Kitabi-Dədə Qorqud"da Xızır, "Abbas və Gülgəz"də Abbas, "Şah İsmayıl"da İsmayıl və b.).

Uşağa Allah, tanrı, mələk, peyğəmbər, imam, övliya, digər dini müqəddəslərin adlarının verilməsi (Xidır, İsa, Musa, Məhəmməd, Əhməd, Davud, Süleyman, Yusif, Cəbrayıl, Əli, Həsən, Hüseyn, Rza, Məryəm, Fatimə, İohan (Yəhya, İvan), Georgi, İbrahim və b.) və ya müqəddəs adlarının orada bir komponent kimi iştirakı (Allahverdi, Allahyar, Tanrıverdi, Xudaverən, Xudaverdi, Xudayar, Xanhüseyn, Xanəhməd, Xanməmməd, Yarməmməd, Əlizamin, Əliqulu, Əlyar, Həsənqulu, Hüseynqulu, Rzaqulu, Pənahəli, Mehrəli, Fatmagül, Fatmanisə və s.) keçmişdə olduğu kimi indi də insanların adın qoruyucu funksiyasına inamına bağlıdır.

Türk xalqlarında uşağın ilk adını onun qulağına pıçıldamaq adət idi. Bu ilk ad oğlan uşaqlarında kişilik və ya qəhrəmanlıq adından fərqli olaraq, demək olar ki, tamamilə qoruyucu-magik məna kəsb edirdi. Adlar qoruyucu həmaillər – gözmuncuğu, dua, "hal dişi" kimi uşağı mühafizə etməli idi. Azərbaycanda islamın qəbulundan başlayaraq son dövrlərədək niyyət edilib "Quran" açmaqla orada barmaq qoyulan sözün ad kimi verilməsi adəti də uzun müddət yaşamışdı. Vaxtilə Yuləd, Yasin, Aləm, Sənəm, Surə, Bəkir, Əhəd, İslam, İnsan, Cuma, Nəbi, Nisə, Qələm, Tükəzban və başqa bu kimi adların böyük bir qismi məhz bu usulla qoyulmuşdu. "Qurbani" dastanının qəhrəmanın adı, sakral tematikayla əlaqəli antroponimikaya ən bariz nümunədir. Qurban mifologiyada və bütün dinlərdə insanla Allah arasında əhdin, ilahiyə tam inamın təzahürüdür. Qurban kəlməsinin ərəbcədə "yaxın olmaq" (yəni Allaha yaxın olmaq) kimi ilkin mənası da bunu təsdiqləyir. Bütün mədəniyyətlərdə qurban sakral mahiyyətlidir və təsadüfi deyil ki, bu qurban bəzən tanrının öz oğlu (xristianlıqda İsa Məsih) və ya peyğəmbər oğlu (İslamda İbrahim peyğəmbərin oğlu İsmayıl) olur.

Mif və nağıllarda, arxaik eposlarda tanrıların öz övladlarını öldürməsi, padşahların "taxt-tacı əldən getməsin deyə" yeni doğulan oğlan uşaqlarının qətlinə fərman verməsi yəqin ki, qurbanvermənin ilkin formaları ilə əlaqələnə bilər.

Yayğın rəvayətə görə, İbrahin peygəmbər Allahdan bir övlad istəmiş və bu övladını müəyyən yaşa yetdikdə Allaha qurban kəsəcəyinə and içmişdi. Allah-taala onun sözünü eşitmiş, İbrahimə oğlu İsmayılı nəsib etmişdi. İsmayıl öz vədini yerinə yetirıb, oğlunu qurban vermək istədikdə, Allah göydən bir qoç endirmiş və İbrahimə oğlunun yerinə bu qoçu qurban edilməsini hökm etmişdir. İslamda İsmayıl qurbanı İbrahimin sınağı kimi başa düşülür. Bu səbəbdən, qurban Həcc ziyarətinin mühüm hissəsini təşkil edir.

Dini-fəlsəfi baxışa görə İsa Məsih insanlıq naminə özünü qurban vermişdir. Bu baxımdan "Qurbani" dastanının qəhrəmanı Qurbaninin adının semantikası islam mistisizminə, sufizmə bağlıdır. Aşıq yaradıcılığının ən iri həcmli janrı olan dastanlarda sufi semantika bir çox yönlərdə, o cümlədən şəxs adları səviyyəsində təcəssüm etmişdir. "Aşıq Qərib və Şahsənəm"da Qərib, "Aşıq Qurbani"də Qurbani, "Leyli və Məcnun"da Məcnun, "Miskin Abdal"da Miskin Abdal kimi əsas qəhrəman adları aşıq yardıcılığında yeni məna qazanmış və sufi ideyanın ifadəsinə çevrilmişdilər. Sufilər Allah dərgahından ayrılmış ruhun öz əzəli, sakral başılanğıcına qayltmağa can atmasını – eşqi tərənnüm edir, özlərinin dini-irfani təkamül yolunun yolçuları olduqlarını ifadə etmək üçün Miskin, Qərib, Xəstə, Dərviş, Abdal və s. bu kimi təxəllüslər qəbul edirdilər.

Azərbaycan eposunda təkcə igidliyə, qəhrəmanlığa görə ad almırlar, eləcə də epik qəhrəmana ideya-mənəvi təkamülünə görə da yeni ad verilə bilir. Məsələn, "Əsli və Kərəm"də Mahmud, "Aşıq Qərib"də Rəsul buta alıb haqq aşığna çevriləndən sonra yeni adlar alırlar. Bu adların xalq sufizminə və folklora bağlılığı dastan mətnlərində aydın ifadə olunur.

Digər yandan İslam dini dünyagörüşünün hakim olduğu mərhələdə epik qəhrəmanları çoxu həm də dini xilaskar funksiyası yerinə yetirirdilər. İslamın pərvəriş tapdığı yüzilliklərdə yazıya alınan türk qəhrəmanlıq dastanlarına baxsaq, orada da epik qəhrəmanların Allah-taalanın insanları qurtarmaq üçün göndərdiyi iddia edilən çoxlu nümunələr tapa bilərik. Məsələn XIII əsrə aid edilən

türk yazılı dastanı "Battalnamə"də Allahın Battalı müsəlmanları küfrün ziyanından və kafirlərdən qorumaq üçün gördərilmiş, xüsusi seçilmiş adam olaması ayrıca vurğulanır. Bu baxımdan qəhrəmanın islami ad daşıması və ya əski adla paralel yeni – islamla bağlı ad daşıması faktlarda (məsələn Koroğlu bəzi variantlarda Rövşən-Əli adlanır) özünü göstərə bilir.

7) Əski inamlarla bağlı olub mifoloji varlıqları ifadı etdirən adlar ("Oğuz kağan" da Oğuz, "Koroğlu"da Pərizad, Koroğlu, Hürü, "Əmrah" dastanında Sayad Pəri və b.).

"Kitabi-Dədə Qorqud" oğuz igidlərindən biri əjdaha anlamı verən Əvrən adı daşıyır. Adın əjdaha ilə bağlı semantik məna kəsb etməsi onun "Əjdəhalar ağzından adam alan" genişlənmiş epitetində qorunub: "Əjdəhalar ağzından adam alan Dəlü Əvrən bilə varsun!" (Zeynalov, Əlizadə, 1988: 95)

"Əmrah" dastanında Sayad Pəri obrazının da həm ad, həm funksiya baxımından meşə ilahələri olə maraqlı bağlantısını hiss etmək olar. Bunu, nəinki onun Ovçu Pəri mənası verən adında, eləcə də bağın – meşənin keşiyini çəkməsində, atası Mahmud kişinin ov tərlanı saxlamasında və Əmrahı bu tərlana yaxşı tərif deyə bildiyinə görə əhv edib, qızını ona verməsində görmək olar.

Görkəmli Azərbaycan mifoloqu M.Seyidova görə, Koroğlu mifik semantikası etibarilə dağ kultu ilə bağlı idi. Alimin qənaətincə, türk-Altay xalqlarının təsəvvürlərində yeraltı ruhlar kor təsəvvür edilirdilər və Alı kişi obrazında dağ, çöl ruhları ilə bağlı bu cür təsəvvürlər əks-səda tapmışdı (Seyidov, 1978: 184-207). Dağ ruhunun döşlərindən süd əmmək kimi şaman təsəvvürləri Koroğlunun eposda Qoşabulaq kimi verilən bulağın ağ süd kimi köpüklü suyundan içməsində izlənilə bilir. Bu sudan içdikdən sonra Koroğlu həm yenilməz qəhrəmana çevrilir, həm də ona aşıqlıq verilir. Koroğlunun digər türk xalqları arasında yayılmış variantlarında qəbirdə döğulması onun yerin övladı olması anlamına gəlir.

Azərbaycan folklorşünaslığında Koroğlunun ovçuluq, çöl-meşə ruhları ilə əlaqəsi barədə araşdırmalar aparılmamışdır. Halbuki, dastanın bir-neçə qolunda dəlilərin ova çıxmasından bəhs edilir. Qeyd edək ki, bir çox "Koroğlu" mətnlərində qəhrəmanın məskəni Çəmlibel, Şəmlibel, Çamlıbel adlandırılır. Bu da heç də çənli-çiskinli dağ beli deyil, eyni zamanda şam (cam) ağacları ilə örtülü dağ beli kimi başa düşülür.

Azərbaycan folklorunda yemək-icmək, əyləncə məclisləri meşə, çöl ruhları – qulyabanılar, cinlər, alarvadılar ilə bağlı miflərdə sıx-sıx keçir: İnsanlar çoldə, meşədə tez-tez belə şadlıq məclislərinə rast gəlir, orada qonaq edilir, qabağına min cür təamlar qoyulur, amma "Bismillah" dedikdə hər şey yoxa çıxır.

Qədim yunan miflərində təbiət ruhları – nimfa və satirlər meşələrdə, çay sahillərində yaşayan və eyş-işrətlə məşğul varlıqlar kimi təsəvvür edilirdilər. Koroğlu daha çox gəncliyi, şadyanalığı təcəssüm etdirir. O daim şadlıq, yeyib-içmək məclisləri təşkil edir, bütün varidatlarını bu məclislərə xərcləyir.

"Koroğlu" dastanında tez-tez qeyd olunur ki, Koroğlunun çoxsaylı qonaqlıqları səbəbində Çənlibeldə "yeməyə-içməyə bir şey qalmamışdı". Beləliklə, biz deyə bilərik ki, Koroğluda nə qədər səma, göylərlə bağlı "Tanrı oğlu" xarakteri əks olunubsa, bir o qədər də təbiət (çöl, dağ, meşə) ruhları ilə bağlı qədim təsəvvürlər cəmlənib. Koroğlu adının struktur semantikası göstərir ki, bu adda bir-çox mədəni-tarixi laylar və mifoloji əksliklər birləşmiş və müxtəlif mətnlərdə funksionallaşa bilmişlər.

Qeyd edək ki, bəzi araşdırmalarda "Koroğlu" eposundakı Alı obrazının (Koroğlunun atası) adı da "al" kökünə bağlayır və dağ ruhu ilə əlaqələndirir (Seyidov, 1989: 447). M.Seyidov Qaraqoyunlu tayfalarının Almaz/Almas adlı ilaha və ya mələyə inandıqlarını xatırladır və onu digər türk xalqlarında olan Albız /Albys (yakutlarda müharibə ilahı) obrazlarına bağlayır (Seyidov, 1989: 447). Burada qeyd edək ki, "Koroğlu" dastanının bir variantında Koroğlunun atını və özünü öldürən iki adamdan birinin adı Almaz xan kimi verilir (Abbaslı, 1997: 196). Almaz xan həm də yalançı obrazıdır. Həmin variantada Koroğlu özü Qırat öldüyü üçün daha yaşamaq istəməyib, onu öldürmələrinə imkan verdiyi halda, Almaz xan Çənlibelə gedib, Koroğlunu döyüşdə öldürüb, başını gətirdiklərini Şah Abbasa söyləyir. Amma mistik bir işarət (Koroğlunun başından bir damla qan

sıcrayıb Şah Abbasın ətəyinə düşür və şah bu anlayır ki, bu, "nahaqq qan"dır) nəticəsində Almaz xanın yalanı üzə çıxır və onu cəzalandırırlar (Abbaslı, 1997: 197).

8) Estetik məzmunlu adlar. Gözəllik və müsbət keyfiyyət ifadə edən adlar Azərbaycan dastanlarında əsasən qadın adlarıdır ("Kitabi-Dədə Qorqud"da Banuçiçək, "Koroğlu"da Nigar, Mərcan xanım, "Məhəmməd və Güləndam"da Güləndam və b.). "Kitabi-Dədə Qorqud"da, "Koroğlu"da, Azərbaycan məhəbbət dastanlarında qadınlar, aktiv və ya passiv olmalarına baxmayaraq, demək olar ki, hamısı müsbət personajlardır. Onlar bəzi hallarda düşmən qızları (Sarı donlu Selcan xatun, Nigar xanım, Məhbub xanım və b) olsalar belə, qəhrəman qütbündə qərar tuturlar.

Tarixi mənbələrə, epik abidələrə baxsaq, hərb, cəngavərlik mövzusu aktual olduğu çağda qədim oğuz kişi adları içərisində gözəllik ifadə edən adlara, demək olar ki, rast gəlmirik. Estetik anlamlı komponentlər oğuzlarda və ümumən qədim türk eposunda adətən qadın adlarında yer alır. Lakin daha sonrakı tarixi mərhələlərdə, hərbi mövzusunun aktuallığını itirməsi ilə Azərbaycanda estetik məzmunlu kişi adları da geniş yayılmağa başlayıb. Xüsusən bir eşq tərənnümçüləri olan aşıqların timsalında bu hal epik yaradıcılıqda da özünü açıq biruzə verib.

Bu mövzuda danışarkən son əsrlər Azərbaycan qadın və kişi adlarında "gül" komponentinin aktiv iştirakını da qeyd etməliyik. Maraq üçün qeyd edək ki, Sovet dönəmindən əvvəl Azərbaycanın cənub zonasında qadın adlarının əvvəlində və ya sonunda "gül" kəlməsinə çox rastlandıldığından qadınların bir-birlərinə adlarını bilmədikləri halda belə "Gülü" deyə müraciət edərdilər. Azərbaycanlılar arasında "gül" hissəciyinin iştirak etdiyi kişi adları da az deyildir (Güloğlan, Gülağa, Güləli, Gülbala, Gülhüseyn, Gülməmməd, Güləhməd və s.). "Gül" komponentli qadın adları oğuz mənşəli xalqların ad vermə sistemində geniş rastlanılır. Tarixi mənbələrfən məlumdur ki, Xəzər xaqanının Bizans imperatoruna ərə getmiş qızının adı da Çiçək olmuşdur. Qeyd edək ki, türklər arasında qadın adı kimi yayğın olan Çiçək adı təkcə estetik mahiyyət daşımamışdır. Bilirik ki, bir çox xalqların mifologiyasında güllər müxtəlif tanrılarla assosiasiya edilirdi. Məsələn, qədim romalılar verbena gülünü Venera ilahəsinin gülü sayır, onun ailə səadəti və məhəbbətlə bağlayırdılar. Yunan miflərinə görə, tanrıların yerə düşən qan, süd və ya göz yaşı damcılarından müxtəlif güllər yaranmışdır. Bəzi güllər isə ümumiyyətlə tanrıların transformasiyası idilər. Buddizmdə tanrı cicəyi lotos (nilufər) müqəddəs idi və onun təsvirinə səadət simvolu kimi Cənub-Şərqi və Orta Asiya xalqlarının maddi mədəniyyət abidələrində geniş rastlanılır. Orta Asiyanın bəzi yerlərində gül kultu vardı və onun izləri özbəklər və taciklər arasında yaşamaqdadır (Sukhareva, 1986: 34-42). Buddizmin hələ Kuşanlar dövründə Orta Asiyaya sirayət etməsi, X-XII əsrlərdə türk-uyğurlar arasında, daha sonralar monqol imperiyasında yayılması gülün (konkret halda nilufər gülünün) magik funksiyasına bağlı təsəvvürləri gücləndirmişdi. Beləliklə, biz deyə bilərik ki, Banucicək adı kimi epik qadın adları və ümumən arxaik və orta çağlarda qadına cicək, gül kəlməli adların verilməsi həm də magik mahiyyət daşımış, onun gələcək səadətinin təmininə xidmət göstərmişdir.

Azərbaycan xalq gülüş mədəniyyətini tədqiq edən alim Muxtar Kazımoğlu xalq nağıllarında güllə bağlı motivlərdə və şəxs adlarında mifoloji təsəvvürlərin izlərini görərək yazmışdı: "Pəri qızların qəhqəhəsindən gül-çiçək əmələ gəlməsinə bir həqiqət kimi baxan insan yavaş-yavaş öz gücünə də inanmağa başlayıb və müqəddəsləşdirdiyi ətraf təbiəti özünə daha çox yaxınlaşdırmaq istəyib. Bu inam və istək dildə də öz ifadəsini tapıb. Gülxanım, Güllü, Gülbadam, Gülbuta, Çiçək, Bənövşə, Gülağa, Güloğlan və s. şəxs adları, "gül kimi adam", "gül kimi söz", "gül kimi iş", dəyişikliyə uğrayıb ironik çalar qazanmış "gül ağzını açmaq" və s. ifadə və deyimlər indi metaforik məzmun daşısa da, əslində onlar mifoloji düşüncənin məhsulu kimi meydana çıxıb. Xatırlatdığımız adlar, ifadə və deyimlər insanın güllə mifoloji bağlılığını qabarıq şəkildə əks etdirir" (Kazımoğlu, 2005: 24-24).

9) Qohumluq əlaqələrinə işarə edən adlar və s. Bu adlar, əsasən, "oğlu", "qızı" komponentli adları əhatə edir: Kürdoğlu, Dəmirçioğlu və b.

## Nəticə

Gördüyümüz kimi, Azərbaycan epik folklorunda adların semantik strukturunu mifoloji, tarixi-mədəni, dini və s. komponentlər təşkil edir. Mifoloji kontekst özünü mifoloji varlıqlarla bağlı adlardan əlavə, heyvan komponentli adlarda da qabarıq göstərir. Bir çox hallarda personajın mənfi və ya müsbət xarakteri adına əlavə edilən epitetlərlə təzahür edir (Göyçək Fatma – Keçəl Fatma, Əmir Həmzə - Keçəl Həmzə və s.). Tədricən "Qəhrəmanlıq dövrü"nün başa çatması və türk xalqlarının islam dinini qəbul etməsi ilə epos qəhrəmanlarının da daşıdığı adlar dəyişir. Xüsusən, məhəbbət dastanlarının yaradıcısı və ifaçısı olan aşıqların islam dini-mistik ordenlərinə bağlantısı dastan qəhrəmanlarının daşıdığı adlara təsir göstərir. Qərib, Əli, Məhəmməd, İsmayıl, Cünun və daxili-mənəvi, estetik məna daşıyan adlar ön plana çıxır. Bəzən daha qədim, məsələn Xıdır, Koroğlu kimi daha qədim mifik-epik adlar yeni sufi məna kəsb etməyə başlayır.

## Ədəbiyyat

1. Kurbanova, F.A. (1998). Lingvisticheskiye osobennosti antroponimov v blizkikh rodstvennykh tyurkskikh yazykakh. Avtoref. dis. kand. fil. nauk. Baku.
2. Həqqi, B. (2003). "Koroğlu" – tarixi-mifoloji gerçəklik. Bakı: Nurlan.
3. Abbaslı, İ. (1997). Koroğlu. Paris nüsxəsi (çapa hazırlayan, ön söz qeyd və şərhlərin müəllifi). Bakı: Ozan.
4. Əbu Həyyan Əl-Əndəlusi. (1995). Kitab əl-idrak li-lisan əl-ətrak (Türk dillərini dərketmə kitab). Bakı: Azərnəşr.
5. Bayat, F. (1993). Oğuz epik ənənəsi və Oğuz kağan dastanı. Bakı: Sabah.
6. Dal' V. Tolkovyy slovar' zhivogo russkogo yazyka [Elektronnyy resurs]. https://www.slovardalja.net/word.php?wordid=36716
7. Xəlil, A. (2016). Oğuz eposunun ritual əsasları. Bakı: Elm və təhsil.
8. Azərbaycan dastanları. (2005). 5 cilddə, 3-cü cild. Bakı: Çıraq.
9. Qarabağ: folklor da bir tarixdir. (2012). III kitab. Bakı: Elm və təhsil.
10. Zeynalov, F., Əlizadə, S. (1988). Kitabi-Dədə Qorqud. Bakı: Yazıçı,
11. Seyidov, M. (1978). Alı kişi və Koroğlu obrazlarının prototipləri haqqında. Bakı: "Azərbaycan" jur., № 4. s.184-207.
12. Seyidov, M. (1989). Azərbaycan xalqının soykökünü düşünərkən. Bakı: Yazıçı.
13. Sukhareva, O.A. (1986). Prazdnestva tsvetov u ravninnykh tadzhikov (konets XIX – nachalo XX v.). Drevniye obryady verovaniya i kul'ty narodov Sredney Azii. Moskva: Nauka, s.31-46.
14. Kazımoğlu, M. (2005). Gülüşün arxaik kökləri. Bakı: Elm.

Göndərilib: 04.08.2023 Qəbul edilib: 30.09.2023

**TƏBİƏT ELMLƏRİ**

**NATURAL SCIENCES**

DOI: https://doi.org/10.36719/2663-4619/95/107-112

**Şəhla Əliyeva**
V.Y.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
biologiya üzrə fəlsəfə doktoru
shahlaaliyeva1969@gmail.com
**Fatma Hüseynova**
V.Y.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
tibb üzrə fəlsəfə doktoru
huseynova01049@gmail.com

# PARAZİTAR XƏSTƏLİKLƏRİN ERKƏN DİAQNOSTİKASI

**Xülasə**

Ekzosomlar təxminən 30-120 nm ölçüdə olub, erkən endosomlardan formalaşır. Ekzosomlar müxtəlif xəstəliklərin biomarkeri kimi hələlik az öyrənilmiş diaqnostik və terapevtik vasitədir. Onların identifikasiyası patoloji prosesin erkən (həmçinin latent dövrdə) diaqnostikasına imkan vermiş olur. Ekzosomlar həmçinin az kliniki əlamətli və ya simptomsuz xəstəliklər üçün skrininq alətidir. Güman edilir ki, gələcəkdə ekzosomlar bir çox xəstəliklərin etiopatogenetik müalicəsini təmin edə biləcəklər.

Leyshmaniya parazitlərinin hüceyrəxarici vezikullardan istifadəsi infeksiyanın sahibin orqanizmində saxlanılması mexanizminin əsas hissəsidir. Bu həm də immun cavabın modulyasiyası üçün lazımdır. Son illərin tədqiqatları göstərmişdir ki, leyşmanioz əleyhinə terapiyanın səmərəliliyinin artırılması üçün ekzosomlardan istifadə edərək dərman molekullarının (nano-dərman) "ünvana" çatdırılması mümkündür.

***Açar sözlər:*** *ekzosom, leyşmaniya parazitləri, diaqnostika, mikrovezikullar, metalloproteaza, immunitet, modulyator*

**Shahla Aliyeva**
Scientific Research Institute of Medical Prophylaxis named V.Y.Akhundov
PhD in Biology
shahlaaliyeva1969@gmail.com
**Fatma Huseynova**
Scientific Research Institute of Medical Prophylaxis named V.Y.Akhundov
PhD in Medicine
huseynova01049@gmail.com

## Early diagnosis of parasitic diseases

**Abstract**

Exosomes are approximately 30-120 nm in size and are formed from early endosomes. Exosomes as a biomarker for various diseases still remain a poorly understood diagnostic and therapeutic tool. Their identification makes it possible to diagnose the pathological process in the early stages (including in the latent period). Exosomes are also a screening tool for diseases with little or no clinical signs. It is believed that in the future, exosomes will be able to provide etiopathogenetic treatment for many diseases.

The use of extracellular vesicles by leishmaniasis parasites is a major part of the mechanism for maintaining infection in the host. It is also necessary to modulate the immune response. Recent

studies have shown that exosomes can be used to deliver drug molecules (nanodrugs) to the "address" to increase the effectiveness of antileishmaniasis therapy.

***Keywords:*** *exosome, leishmania parasites, diagnostics, microvesicles, metalloprotease, immunity, modulator*

## Giriş

Ekzosomları ilk dəfə 1946-cı ildə E.Chargaff və R.West müşahidə etmişlər. Sonralar P.Wolf (1967), H.C.Anderson (1969) tərəfindən ekzosomlar aşkar edilmişdir. Lakin məhz hüceyrəxarici mikrovezikul kimi ekzosomlar 1990-cı illərdə təsvir edilmişdi (Johnstone, 1992: 179-90).

Hüceyrəxarici vezikullar bioloji membranın obyekti olub, ölçüsü 1000 nm-dən azdır. Onların əsas funksiyası – bioloji aktiv molekulların transportudur. Həmçinin hüceyrələrarası əlaqəni təmin edir və digər bioloji funksiyaları yerinə yetirirlər.

Ekzosomlar HEB (hemato-ensefalik baryer) keçmək xüsusiyyətinə malikdirlər, patogen agentin təsirinə cavab olaraq immun sistemin fəaliyyətini koordinasiya edə bilirlər (Cui, Houston, 2016: 147-158). Onlar hüceyrəarası əlaqələri anadangəlmə və adaptiv immunitet reaksiyaları vasitəsilə tənzimləyə bilirlər. Bu, törədicinin identifikasiyası çətin olduğu hallarda və ya yeni ştammın müəyyənləşdirilməsi zaman çox aktualdır. Məhz ekzosom biogenezi törədicini identifikasiya etməyə imkan verir.

Yaranma mexanizmi və ölçüsünə görə hüceyrəxarici vezikullar 3 əsas qrupa bölünür: apoptotik cisimciklər, mikrovezikullar (ektosomlar), ekzosomlar.

Apoptotik cisimciklər az öyrənilib. Ölçüləri ektosomlar kimi 100-1000 nm olub, fosfatidilserin tərkiblidirlər. Apoptotik cisimciklər proqramlaşdırılmış hüceyrə ölümü zamanı yaranıb, əsasən nüvə materialı elementlərindən və orqanellalardan ibarət olur.

Mikrovezikullar (ektosomlar) 100-1000 nm ölçüdə olur, xarici membranlarında fosfatidilserin vardır.

Ekzosomlar infeksion prosesin yaranma mexanizmində rol oynayır. 30-100 nm diametrli hüceyrəxarici vezikullar olub, əsasən lipid təbəqəsindən ibarətdir. Ekzosomlar demək olar ki, bütün hüceyrələr (T və B hüceyrələr, dendrit hüceyrələr, oliqodendrositlər, neyronlar, retikulositlər, astrositlər, endotelial və əzələ hüceyrələri) tərəfindən sekresiya olunur. Onlara insanın bioloji mayesində (serum, göz yaşı, süd, tüpürcək, urina) və patoloji mayelərdə (assit zamanı) də təsadüf edilir.

Ektosomları axın sitometriyasının, kiçik ölçülü ekzosomları isə yalnız elektron mikroskopun köməyilə identifikasiya etmək olar.

N.Arraud və əməkdaşları (Arraud, Linares, Tan, 2014: -627) hüceyrəxarici vezikulları sırf morfoloji (forma) baxımdan təsnifatlaşdırmağı təklif ediblər: sferik, çubuqvari, fraqmentar. Bundan əlavə vezikulların mənşəyinə əsasən də klassifikasiyası mövcuddur: eritrositar, trombositar, leykositar. Beləliklə, vezikullar mənşəyinə, forma və funksiyasına görə təsnif edilir.

Ekzosomlar erkən endosomlardan formalaşır. Məhz endosomlardan onlar bir sıra membran zülalları, reseptorlar, tetraspaninlər almışlar. Digər zülallar, RNT, DNT ekzosomların tərkibinə ana hüceyrənin sitoplazmasından keçir.

Mənşəyindən asılı olmayaraq bütün ekzosomların səthində onların membranının hədəf hüceyrə membranına yapışmasına xidmət edən anneksinlər var. Ekzosom səthində həmçinin histoloji uyğunluq kompleksi zülalları (MHC), qlikoproteinlər (lektin, selektin) vardır. Müxtəlif patoloji vəziyyətlərdən asılı olaraq lektinin tərkibi dəyişir. Ekzosomların tərkibinə mikroRNT daxildir. Bu, çox kiçik ölçülü RNT molekuludur və onlar immun sistem, qan, kök hüceyrələri tərəfindən sekresiya olunur. Ekzosomlarda həmçinin mitoxondrial DNT-yə də rast gəlinir. RNT-dən fərqli olaraq ekzosomlardakı DNT adətən patoloji vəziyyətdən (onkoloji xəstəliklər, genetik dəyişikliklər) xəbər verir.

Qeyd edildiyi kimi ekzosomların tərkibində onları yaradan hüceyrənin zülalları, mikroRNT, matriksRNT-si var. Bu, ekzosomlardan, əmələ gəldikləri hüceyrənin identifikasiyası üçün istifadə etməyə imkan verir. Onlar hüceyrənin vəziyyəti haqda informasiya verə bilər. MikroRNT-155 yüksək miqdarda iltihab makrofaqları və aterosklerotik zədələnmələr haqda; ekzosomlarda

mikroRNT Let-7 varlığı şiş hüceyrələrinin aktivliyindən; qan zərdabında ürək əzələsi üçün xarakterik olan mikroRNT -208a miokardın zədələnməsi haqda xəbər verir.

Ekzosomların tədqiq edilməsinin böyük praktik əhəmiyyəti var. Onlar orqanizmin vəziyyəti haqda məlumat verə bilər. Qan zərdabından, sidikdən və digər bioloji mayelərdən alınmış ekzosomlardan diaqnostika üçün mikroRNT əldə etmək olar. Bu yolla həm diaqnoz qoymaq, həm də xəstəliyin ağırlıq dərəcəsini müəyyən etmək, müalicənin effektivliyini yoxlamaq mümkündür.

Hal-hazırda tədqiqatçılar tərəfindən müxtəlif xəstəliklərin inkişaf mərhələlərinin müəyyənləşdirilməsində və preventiv diaqnostikada ekzosomların əsas diaqnostik alət kimi çıxış etmək perspektivi araşdırılır. Bundan başqa ekzosomların müxtəlif xəstəliklərdə terapevtik tətbiqinin mümkünlüyü də aktiv olaraq tədqiq edilir.

Ekzosomlar üzrə diaqnostikanın daha bir üstünlüyü ondan ibarətdir ki, çox ağrılı və bəzən hətta təhlükəli toxuma biopsiyası əvəzinə orqanizmin maye mühitindən istifadə edərək həmin informasiyanı almaq mümkündür. Onlar nəinki diaqnostika, həm də müalicə məqsədilə istifadə edilə bilər. Müalicə məqsədilə istifadəsinə bunlar daxildir: immunoterapiya, vaksin hazırlanması, angiogenez modulyasiyası, hədəf toxumalara müxtəlif dərman preparatlarının - əsas etibarilə strukturu tez pozulan RNT əsaslı (mikroRNT, matriks RNT-si) birləşmələr – çatdırılması **(**Samira, Aisling, 2013: 185-20).

Farmakoloji terapiyanın effektivliyini məhdudlaşdıran faktorlardan biri dərman maddələrinin hədəfə düzgün çatdırılmamasıdır. Bu problem əsasən mərkəzi sinir sistemi xəstələrində özünü daha çox biruzə verir, çünki hədəf hüceyrə əsasən HEB (hemato-ensefalik baryer) daxilində yerləşir. Müasir dövrdə bu problemi aradan qaldırmaq üçün liposomlardan və polimer nanohissəciklərdən istifadə olunur. Lakin bu sistemlərin də öz çatışmazlıqları var: liposomlar stabil deyil, nanohissəciklər stabil olsa da təhlükəsiz deyil. Buna görə də ekzosomların dərman maddələrinin daşıyıcısı kimi tətbiq olunması tibbdə böyük perspektivlər aça bilər. Ölçüsünə görə (30-120 nm) ekzosomlar böyrək filtrlərindən qurtula bilər, yəni bunun üçün kifayət qədər böyükdürlər və eyni zamanda makrofaqlar tərəfindən udulmaq üçün yetərincə kiçikdir.

Həqiqətən ekzosomlar bir çox parametrlərə görə dərman çatdırılması üçün ideal vasitədir. Onlar lipid təbəqəsinə malik olduqları üçün daşıdıqları birləşməni (ferment və ya nuklein turşusu) dağılmadan qoruya bilir.

Bundan əlavə bu vezikullar hüceyrəarası mübadilə proseslərini həyata keçirtdikləri üçün toksik deyil və orqanizm tərəfindən hücuma məruz qoyulmur. Səth reseptorları onlara hədəf hüceyrələri tapmaqda kömək edir. Həmçinin onlar hematoensefalik baryeri də keçə bilirlər. Lazım olduğu təqdirdə ekzosom üzərindəki reseptor tərkibini dəyişərək, onları “yeni ünvana” yönləndirmək mümkündür.

İnsan mezenximal kök hüceyrələri immunosupressiyaya səbəb olub, bərpa prosesini stimulə edə bilirlər. Buna gərə də onlar ürək, böyrək, sinir toxuması, oynaq və sümüklərin regenerasiyasında, iltihab proseslərində, orqan transplantasiyası zamanı orqanizmin aqressiv immun cavabının bloklanmasında tətbiq edilmək üçün tədqiq olunur. Heyvanlar üzərində aparılan klinik tədqiqatlar göstərir ki, mezenximal kök hüceyrələrinin terapevtik effektivliyi onların differensiasiyası ilə yox, onlar tərəfindən sekresiya olunan ekzosomlarla müəyyənləşir. Ekzosomlar xarici mühitin aqressiv faktorlarına qarşı çox davamlı olduqlarından, güman ki, gələcək tədqiqatlar vektoru hüceyrə terapiyasından ekzosomlarla terapiyaya keçəcəkdir. Kütləvi şəkildə ekzosom istehsalı üçün güclü proliferasiyaya qadir olan insan mezenximal kök hüceyrələrinin kulturasından istifadə etmək təklif olunur. Qeyd etmək lazımdır ki, hüceyrələrdən fərqli olaraq ekzosomlar özləri çoxalaraq kontrol altından çıxa bilmirlər və bu da onların xərçəng hüceyrələrinə çevrilə bilmək şansını heçə endirir. Məhz buna görə ekzosomlarla terapiya hüceyrə terapiyasından daha təhlükəsizdir.

Parazitar xəstəliklərdə də mikrovezikulyar strukturların rolu haqda bir sıra ədəbiyyat məlumatı vardır.

Patogen ibtidailərin hər il 100 milyonlarla insanı yoluxduran 70-dən artıq növü məlumdur (*Plasmodium spp., Leishmania spp., Trypanosoma spp.* və s.). Parazitar xəstəliklərlə yoluxmuş və bu səbəbdən həyatını itirmiş insanlardan alınmış biomaterialın tədqiqi göstərir ki, bu insanların

bioloji mayelərində (sidik, qan) canlı ibtidailərdən başqa həm də patogenlər və yoluxmuş hüceyrələr tərəfindən ifraz edilən hüceyrəxarici struktur ekzosomları aşkar edilmişdir. Hissəciklərdə müşahidə edilən antigenlər, toksinlər, genetik material, metabolitlər və digər birləşmələr bu parazitar infeksiyaların patogenezində iştirak edir. Patogen ibtidailərin ekzosomlarda aşkar edilmiş bir çox birləşmələri parazitar invaziyanın messenceri rolunda çıxış edərək, potensial sahib hüceyrələrin bu ibtidailərə invaziya həssaslığını artırır (Woith, Fuhrmann, Melzig, 2019: 205-695).

İnsan orqanizmində hər hansı bir xəstəlikdən bərpa prosesində müəyyən miqdar ekzosom sintez edilir ki, onların da komponentləri hüceyrəarası kommunikasiyanı təşkil edərək, parazitar agentlərin işinin bloklanmasını həyata keçirir. Ekzosomların tərkibini və onların səth reseptorlarını modifikasiya edərək, spesifik nutrientləri, dərman preparatlarını, müxtəlif effektor və inhibitorları hədəf hüceyrəyə daşımaq mümkündür ki, bunun da konkret parazitar infeksiyanın müalicə və profilaktikasında rolu olduqca böyükdür.

**Leyşmaniya parazitlərinin ekzosom mikrovezikulyar strukturları**

Leyşmaniozlar qədim eukariot ibtidailərdən olan leyşmaniyalar (*Leishmania donovani, L.infantum, L.chagasi, L.major* və s.) tərəfindən törədilən transmissiv xəstəliklərdən olub, mürəkkəb həyat tsikli ilə fərqlənir. İlk dəfə 2010-cu ildə leyşmaniozlu xəstələrdə ekzosomlar aşkar edilmişdi. Müəyyənləşdirilmişdi ki, ekzosomların zülal komponentləri parazitlərdən xəstənin immun sistem hüceyrələrinə informasiya daşıyaraq patogen ibtidailərin virulentliyində bilavasitə rol oynayır.

Ekzosomların molekulyar tərkibində bir çox zülal komponentləri (anneksinlər, adheziya molekulları, tetraspaninlər və s.), lipidlər (xolesterin, qlikosfinqolipidlər, lizofosfatidilxolin, sfinqomielin, fosfatidilxolin, fosfatidiletanolamin, fosfatidilserin və s.), nuklein turşuları (mRNT, nRNT, rRNT, mikroRNT, təkzəncirli DNT, mitoxondrial DNT) vardır (Wu, Wang, Li, 2019: 3066).

Leishmania GP63 virulentlik faktorudur. GP63 – sinkdən asılı metalloproteazadır. O, promastiqotların səthində olur. Leishmania genomunda bu proteazı kodlaşdıran genlər var. Leyşmaniya ekzosomlarının metalloproteazası (GP63) tirozinfosfataz və transkripsiya faktorlarının sintezini tənzimləyən makrofaqların immun cavabının modulyasiyasında aktiv iştirak edir, onlar makrofaqlar, monositlər, monositar mənşəli dendrit hüceyrələrin immun reaksiyalarını inhibirə edərək, interleykin (İL)-8-10 və azot oksid (NO) yaranmasını stimulə etmişlər. Bu zaman həm də interferon γ (IFN γ) və şiş nekrozu faktoru α (TNF-α), sitokinlər də inhibirə edilmişdi. Leyşmaniya ekzosomları parazitlərin həyat qabiliyyətini həm tənzimləyə, həm də bloklaya bilirlər. Bundan başqa ekzosomlar immun sistemin müxtəlif hüceyrələrində genlərin işini aktivləşdirir ki, bu da bəzi iltihab sitokinlərinin istehsalının azalmasına (TNF- α; İL – 12p70) gətirir. Patogen ibtidailər (məs. *L.major*) tərəfindən sekresiya olunan ekzosomların proiltihab effektinin nəticəsində iltihab ocağına neytrofillər və eozinofillər cəlb olunur (Malloci, Perdomo, Veerasamy, 2019: 813-56). Ekzosomlar əsasən immunomodulyasiya ilə məşğul olub provirulentlik agenti sayılır. Onlar TNF-α və İL-8, LPS və İL-1 β kimi immun effektorları bloklayır. Leyşmaniyanın hüceyrəxarici vezikulları (LEV) polidispers suspenziyalı sferoidal nanohissəciklər olub, lipid təbəqəli membranla əhatə olunub.

Silverman göstərmişdir ki, Leishmania ekzosomları immuniteti modulyasiya edir (Silverman, Clos, Horakova, 2010:504-522). Parazitin sahib hüceyrəyə keçməsini imitasiya edən temperatur dəyişməsi (25°C-dən 37°C-yə) nəticəsində ekzovezikulların kəskin və çox sürətli ifrazı başlayır. Leishmania ekzoproteomu makrofaqların funksiyasını modullaşdırır, NO sintezini sürətləndirir. Leishmania ekzosomları monositlərə və dendrit hüceyrələrə təsir etməklə anadangəlmə immuniteti (makrofaq və dendritləri) modulyasiya edir. Ekzosomlar həm də adaptiv immun cavabı modulyasiya edir.

*L.braziliensis* və *L.donovani* tərəfindən sekresiya olunan ekzosomlarda zülallardan əlavə genetik material, DNT, RNT, mitoxondri də aşkar edilir. Leyşmaniya ilə yoluxmuş hüceyrələrin, tərkibində RNT-virus1 (LRV1) daşıyan ekzosomlarının biokimyəvi və elektron mikroskopik analizi göstərir ki, ekzosomlardakı bu hissəciklər digər parazit hüceyrələrinə keçərək, onların sahib orqanizmdə virulentliyini dəfələrlə yüksəltmə xüsusiyyətinə malikdirlər.

Son illər *in vitro* şəraitdə parazit tərəfindən sekresiya olunan hüceyrəxarici vezikullar öyrənilməyə başlanılmışdır (Douanne, Dong, Douanne, 2020). Ekzosomların molekulyar təsir mexanizmi və onlarla sahib hüceyrə əlaqələri aydınlaşdırılmalıdır (Dong, Filho, Olivier, 2019: 100).

Ekzosomlar həm pro, həm də antiiltihab immun cavabı stimulə edir, hüceyrədaxili kommunikasiyada iştirak edir, antigen nəql edir, sitokin reaksiyasını modulyasiya edir. T- və B-hüceyrələri qazanılmış immunitetin əsas komponentləridir. B- hüceyrələr xroniki iltihab proseslərində sitokinlərin əsas mənbəyi olub, antigen-spesifik antitellər yaradır və T hüceyrələri aktivləşdirir. T hüceyrələr B-1 hüceyrələr ilə birlikdə çoxlu İL-10 sintez edir, parazitin canlılığını qoruyur (Gabriel, Bolas, Marques, 2019). Parazitar ekzosomların spesifik zülalları və mikroRNT-si yeni vaksin preparatları hazırlanmasında tətbiq edilə bilər (Khosravi, Mirsamadi, Mirjalali, 2020: 2957-69). Ekzosomlara bioloji aktiv birləşmələr müxtəlif üsullarla yeridilir – elektroporasiya, passiv diffuziya, transfeksiya (Hartjes, Mytnyk, 2019: 7). Parazitar xəstəliklərin ekzosomlarla müalicəsi effektivliyi təkcə bu ekzosomların mənşəyindən deyil, həm də onların orqanizmə daxil edilməsi yollarından da (inyeksiya, oral, intranazal) asılıdır.

## Nəticə

Ekzosomların bütün bioloji mayelərdə rast gəlinməsi “maye biopsiyası”nın köməyilə qeyri-invazion diaqnostikaya imkan verir. Bu zaman müxtəlif toxumaların hüceyrədaxili komponentləri haqda məlumat ekzosom tərkibinin öyrənilməsi ilə əldə edilir.

Sonda qeyd etmək lazımdır ki, ekzosomların öyrənilməsi həm fundamental, həm də klinik tədqiqatların sürətlə inkişaf edən yeni sahəsi kimi çox populyar olub diqqəti cəlb edir. Fizioloji və patoloji şəraitlərdə ekzosomların rolu, onların funksiyası haqda geniş məlumat əldə etmək üçün bu sahə ətraflı öyrənilməlidir. Çox güman ki, bu sahə gələcəkdə hüceyrəarası əlaqələrin mexanizminin öyrənilməsi, yeni diaqnostika və müalicə metodlarının işlənib hazırlanması üçün əvəzsiz imkanlar açacaq.

## Ədəbiyyat

1. Johnstone, R.M. (1992), Maturation of reticulocytes: formation of exosomes as a mechanism for shedding membrane proteins. Biochemistry and Cell Biology, 70(3-4), pp.179-90.
2. Cui, L., Houston, D.A. (2016). Characterisation of matrix vesicles in skeletal and soft tissue mineralisation. Bone, 87, pp.147-158.
3. Arraud, N., Linares, R., Tan, S. (2014). Extracellular vesicles from blood plasma: determination of their morphology, size, phenotype and concentration. J Thromb Haemos., 12, pp.614-627.
4. Samira, L., Aisling, J. (2013). RNAi Therapeutic Delivery by Exosomes. Advances in Delivery Science and Technology, 185-20.
5. Woith, E., Fuhrmann, G., Melzig, M.F. (2019). Extracellular vesicles - connecting kingdoms. Int J Mol Sci., 205695.
6. Wu, Z., Wang, L., Li, J. (2019). Extracellular vesicle-mediated communication within host-parasite interactions. Front Immunol, 9: 3066.
7. Malloci, M., Perdomo, L., Veerasamy, M. (2019). Extracellular vesicles: mechanisms in human health and disease. Antioxid Redox Signal, 30: 813-56.
8. Silverman, J.M., Clos, J., Horakova, E., (2010). Leishmania Exosomes Modulate Innate and Adaptive Immune Responses through Effects on Monocytes and Dendritic Cells. J Immunol., 10, pp.504-522.
9. Douanne, N., Dong, G., Douanne, M. (2020). Unravelling the proteomic signature of extracellular vesicles released by drug-resistant *Leishmania infantum* parasites. PLoS Negl. Trop. Dis., 14:e0008439.
10. Dong, G., Filho, A.L., Olivier, M. (2019). Modulation of Host-Pathogen Communication by Extracellular Vesicles (EVs) of the Protozoan Parasite *Leishmania*. Front. Cell. Infect. Microbiol. 9:100.
11. Gabriel, A., Bolas, A.S., Marques, J. (2019). Cutaneous Leishmaniasis: The Complexity of Host’s Effective Immune Response against a Polymorphic Parasitic Disease. J. Immunol. Res., 2603730.

12. Khosravi, M., Mirsamadi, E.S., Mirjalali, H. (2020). Isolation and functions of extracellular vesicles derived from parasites: the promise of a new era in immunotherapy, vaccination, and diagnosis. Int J Nanomed. 15: 2957-69.
13. Hartjes, T.A., Mytnyk, S. (2019). Extracellular vesicle quantification and characterization: common methods and approaches. Bioengineering, 6:7.

Göndərilib: 21.08.2023 Qəbul edilib: 03.10.2023

DOI: https://doi.org/10.36719/2663-4619/95/113-120

**Yeganə Mahmudova**
Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi Zoologiya İnstitutu
yeganemahmudova@mail.ru

# ARAZ ÇAYININ SAHİLYANI ƏRAZİLƏRİNDƏ SU QUŞLARININ TREMATODOZ TÖRƏDİCİLƏRİNİN EPİZOOTOLOJİ VƏ EPİDEMİOLOJİ QİYMƏTLƏNDİRİLMƏSİ

**Xülasə**

2021-2023-cü illərdə Azərbaycan Respublikasının Araz sahili ərazilərində 21 növə aid olan 128 ədəd su-bataqlıq quşu tam helmintoloji yarma üsulu ilə tədqiq olunmuş, 63 növ trematod tapılmışdır, bunlardan 2 növ Azərbaycan faunası üçün ilk dəfə olaraq müəllif tərəfindən göstərilmişdir. Aşkara çıxarılmış trematodlardan 13 növ epizootoloji və ya epidemioloji əhəmiyyətə malikdir. Bunların əksəriyyəti quşların bağırsağında parazitlik edir, digər orqanların hər birində cəmi bir patogen trematod növü tapılmışdır. Məqalədə bu növlərin, sahibləri və lokallaşması verilməklə, təsnifat icmalı təqdim olunur, onların hər birinin öz sahibinin orqanizminə olan təsiri göstərilir. Belə ki, əldə edilmiş trematodlardan 6 növü quşlarda, 6 növü isə balıqlarda xəstəlik törədir, 1 növ quşlarla xəsrəlik törətməklə yanaşı həm də insanın və yırtıcı ev heyvanlarının bağırsaq parazidir, quşlar üçün təhlükəli olan 2 növün serkariləri suda insana da hücum edib qeyri-spesifik serkarioza səbəb olur,

***Açar sözlər:*** *epizootologiya, epidemiologiya, Araz çayı, su-bataqlıq quşları, trematodlar*

**Yegana Mahmudova**
Institute of Zoology of Ministry of Science and Education of the Republic of Azerbaijan
yeganemahmudova@mail.ru

## Epizootological and epidemiological assessment of causative trematodosis of waterbirds in the coastal areas of the Araz River

**Abstract**

In 2021-2023, in the coastal areas of the Araz River within the Republic of Azerbaijan, 128 waterbirds belonging to 21 species were studied by the method of complete helminthological dissection, 63 species of trematodes were discovered, of which 2 species for the fauna of Azerbaijan were indicated for the first time by the author. Of the detected trematodes, 13 species are of epizootological or epidemiological significance. Most of them parasitize in the intestines of birds; in each of the other organs, only one pathogenic species of trematode found. The paper provides a taxonomic overview of these species, indicating their hosts and localization, and reflects the influence of each of them on the body of its host. Thus, of the discovered trematodes, 6 species cause diseases in birds, and 6 species in fish, 1 species is an intestinal parasite not only of birds, but also of humans and predatory domestic animals; cercariae of 2 species, that pathogenic for birds, in water also infect humans and cause he has nonspecific cercariasis.

***Keywords:*** *epizootology, epidemiology, the Araz River, water birds, trematodes*

## Giriş

Araz çayının Azərbaycan Respublikası ərazisindən axan hissəsi boyu yerləşmiş ərazilərdə su-bataqlıq quşlarının helmintlərinin, o cümlədən trematodlarının öyrənilməsi mühüm nəzəri və praktiki əhəmiyyətə malikdir. Buna baxmayaraq, bizim apardığımız tədqiqatlara qədər onların haqqında yalnız bəzi epizodik məlumatlara S.M.Vahidovanın (Vahidova, 1978: 238). Azərbaycan quşlarının helmintlərinə həsr olunmuş və 40 il bundan əvvəl çapdan çıxmış kitabında təsadüf

olunur. Bununla əlaqədar olaraq, bu məqalənin məqsədi Araz çayı boyu olan ərazilərdə su-bataqlıq quşlarının trematod faunasının ekoloji-faumistik təhlilini vermək olmuşdur.

**Material və metodika.**

2021-2023-cü illərdə Azərbaycanın Saatlı, Sabirabad və İmişli rayonlarında aşağıda adı çəkilən 21 növə aid olan 128 ədəd su-bataqlıq quşu tam helmintoloji yarma (Dorovskikh, Stepanov, 2009: 131; Krone, 2008: 559-61; Crowmik, 2013: 218-223). üsulu ilə tədqiq olunmuşdur: iri maygülü – *Podiceps cristatus* Pallas – 7 ədəd, kiçik maygülü – *P. ruficollis* Pallas – 8 ədəd, iri qarabattaq – *Phalacrocorax carbo* L. – 8 ədəd, kiçik qarabattaq – *Ph. pygmaeus* Pall. – 7 ədəd, qaranaz – Plegadis falcinellus L. – 3 ədəd, Misir vağı – Bubulcus ibis (L.) – 5 ədəd, iri ağ vağ – *Egretta alba* (L.) – 6 ədəd, kiçik ağ vağ – *E. garzetta* (L.) – 5 ədəd, boz vağ – *Ardea cinerea* L. – 5 ədəd, boz qaz – *Anser anser* (L.) – 6 ədəd, ağ qaz – *A. caerulescens* L. – 7 ədəd, yaşilbaş ördək – *Anas platyrhynchos* L. – 7 ədəd, enlidimdik ördək – *A. clypeata* L. – 6 ədəd, qirmizibaş dalğıc – *Aythya ferina* (L.) – 4 ədəd, qaşqaldaq – *Fulica atra* L. – 11 ədəd, caydaq cüllüt – *Himantopus himantopus* L. – 5 ədəd, çibis – *Vanellus vanellus* (L.) – 3 ədəd, gümüşü qağayı – *Larus argentatus* Pontopp – 7 ədəd, adi qağayı – *L. ridibundus* L. – 8 ədəd, kiçik sterna – *Sterna albifrons* Pall. – 5 ədəd, adi sterna – *S. hirundo L.* – 5 ədəd. Bunların arasında ekspedisiyalar zamanı Araz sahili ərazilərdə və axmazlarda naməlum səbəbdən ölmüş ayrı-ayrı növlərdən olan 19 ədəd su quşları da vardır. Quş növlərinin təyinatı zamanı müvafiq monoqrafiyalardan (Mustafayev, 2004: 35; Mustafayev, 2004: 261-411; Mustafayev, 2005: 419; Tuayev, 1996: 240) istifadə olunmuşdur.

Əldə edilmiş bütün quşlar ümumi qəbul olunmuş (Dubinina, 1971: 140; Pronina, Pronin, 2007: 52; Dorovskikh, Stepanov, 2009: 131) tam helmintoloji yarma üsulu ilə tədqiq olunmuşdur. Tədqiqatlar zamanı aşkar edilmiş trematodlar asetat turşulu karminlə boyanmış, etil spirtinin 70º-dən 100º-dək qatılıqda artan sırasından keçirildikdən sonra qərənfil yağında və ya dimetil-ftalatda şəffaflaşdırılmış, əşya şüşəsi üzərində bir damla Kanada balzamına qoyulub örtük şüşəsi ilə qapanmış və beləliklə daimi preparatlar hazırlanmışdır. Trematodların bütün preparatları laboratoriya şəraitində kameral tədqiq olunmuşdur. Trematod növlərinin identifikasiyası müvafiq təyinedicilər (Bykhovskaya-Pavlovskaya, 1962: 407; Gayevskaya, Gusev, Delyamure, Donets, Iskova, 1975: 552) əsasında həyata keçirilmişdir.

**Nəticələr və onların müzakirəsi**

Bizim həyata keçirdiyimiz tədqiqat nəticəsində Araz çayı boyu olan ərazilərdə yaşayan su-bataqlıq quşlarında 3 dəstəyə, 18 fəsiləyə, 38 cinsə aid olan 59 növ trematod aşkara çıxarılmışdır: *Echinostoma revolutum* (Fröhlich, 1802), *E. sudanense* Odhner, 1911, *Echinoparyphium aconiatum* Dietz, 1909, *E. recurvatum* (Linstow, 1873), *Patagifer bilobus* (Rudolphi, 1819), *Petasiger exaeretus* Dietz, 1909, *P. megacantha* (Kotlan, 1922), *P. phalacrocoracis* (Yamaguti, 1939), *Echinochasmus amphibolus* Kotlan, 1932, *E. beleocephalus* (Linstow, 1873), *E. coaxatus* Dietz, 1909, *E. coronatus* (Mendheim, 1940), *E. dietzevi* Insaltschikov, 1927, *E. intermedius* Skrjabin 1919, *E. spinulosus* (Rudolphi, 1809), *Mesorchis denticulatus* (Rudolphi, 1802), *M. pseudoechinatus* (Olsson, 1876), *Pelmatostomum episemum* Dietz, 1909, *Aporchis massiliensis* Timon-David, 1955, *A. rugosus* Linton, 1928, *Cyclocoelum obscurum* (Leydi, 1887), *C. mutabile* (Zeder, 1800), *Haematotrephus tringae* (Brandes, 1892), *Hyptiasmus oculeus* Kossack, 1911, *Notocotylus attenuatus* (Rudolphi, 1809), *Catatropis verrucosa* (Frönlich,1789), *Paramonostomum alveatum* (Mehlis, 1846), *P. elongatum* Yamaguti, 1934, *Galactosomum phalacrocoracis* Yamaguti, 1939, *Cercarioides aharoni* Witenberg, 1929, *Opisthorchis geminus* (Looss, 1896), *O. simulans* (Looss, 1896), *Hepatiarius longissimus* (Linstow, 1833), *Pachytrema calculus* (Looss, 1907), *Leucochloridium holostomum* (Rudolphi, 1819), *Clinostomum foliiforme* Braun, 1899, *C. complanatum* (Rudolphi, 1819), *Euclinostomum heterostomum* (Rudolphi, 1809), *Eucotyle cohni* Skrjabin, 1924, *Tanaisia fedtschenkoi* Skryabin, 1924, *Philophthalmus gralli* Mathis et Leger, 1910, *Plagiorchis brauni* Massino, 1927, *P. cuneatus* (Rudolphi, 1899), *Prosthogonimus cuneatus* (Rudolphi, 1899), *Psilochasmus longicirratus* Skjabin, 1913, *Stomylotrema rotundo* Tubangui, 1928, *Bilharziella polonica* (Kowalewski, 1895), *Strigea falconis* Szidat, 1928, *Apharyngostrigea cornu* (Zeder, 1800), *Parastrigea robusta* Szidat, 1928, *Cotylurus cornutus* (Rudolphi, 1808),

*Diplostomum mergi* Dubois, 1932, *D. chromatophorum* (Brown, 1931), *D. commutatum* (Diesing, 1850), *D. rutili* Razmashkin, 1969, *D. spathaceum* (Rudolphi, 1819), *Hysteromorpha triloba* (Rudolphi, 1819), *Posthodiplostomum cuticola* (Nordmann, 1932), *Tylodelphys clavata* (Nordmann, 1832).

Yuxarıda adı çəkilmiş trematodların arasında 13 növ epizootoloji və ya epidemioloji əhəmiyyətə malikdir. Aşağıda həmin növlərin, sahibləri və quşların orqanizmində lokallaşması göstərilməklə, təsnifat icmalı təqdim olunur.

Sinif *Trematoda* Rudolphı, 1808

Dəstə *Fasciolida* Skrjabin et Guschanskaja, 1962

Fəsilə *Echinostomatidae* Dietz, 1900

*Echinostoma revolutum* (Fröhlich, 1802)

Sahibləri: iri qarabattaq, kiçik qarabattaq, boz qaz, ağ qaz, yaşılbaş ördək, qırmızıbaş dalğıc, qaşqaldaq, adi sterna.

Lokallaşması: bağırsaq.

*E. sudanense* Odhner, 1911

Sahibləri: iri qababattaq, iri ağ vağ, boz vağ, yaşılbaş ördək

Lokallaşması: bağırsaq.

Fəsilə *Notocotylidae* Lühe, 1909

*Notocotylus attenuatus* (Rudolphi, 1809)

Sahibləri: ağ qaz, yaşılbaş ördək, qırmızıdimdik dalğıc.

Lokallaşması: bağırsaq.

*Catatropis verrucosa* (Frönlich,1789)

Sahibləri: boz qaz, enlidimdik ördək.

Lokallaşması: bağırsaq.

Fəsilə *Eucotylidae* Skrjabin, 1924

*Tanaisia fedtschenkoi* Skryabin, 1924

Sahibləri: qaşqaldaq, gümüşü qağayı, adi sterna, kiçik sterna.

Lokallaşması: böyrəklər.

Dəstə *Schistosomatida* (Skrjabin et Schulz, 1937)

Fəsilə *Ornithobilharziidae* Azimov, 1970

*Bilharziella polonica* (Kowalewski, 1895)

Sahibləri: kiçik maygülü, boz qaz, yaşılbaş ördək, qaşqaldaq, adi qağayı, kiçik sterna.

Lokallaşması: bağırsağın, qaraciyərin, ürəyin, mədəaltı vəzinin, dalağın və böyrəklərin qan damarları.

Dəstə *Strigeidida* (La Rue, 1926)

Fəsilə Strigeidae Railliet, 1919

*Strigea falconis* Szidat, 1928

Sahibləri: iri maygülü, kiçik maygülü, iri qarabattaq, kiçik qarabattaq, iri ağ vağ, ağ qaz, yaşılbaş ördək, enlidimdik ördək, qaşqaldaq, caydaq cüllüt, gümüşü qağayı, adi qağayı.

Lokallaşması: dəri altındakı piy toxuması və birləşdirici toxuma, qida borusunun və traxeyanın ətrafları, boyun, döş, ayaq və baş əzələlərinin fassiyalarının altı.

Fəsilə *Diplostomatidae* Poirier, 1886

*Diplostomum mergi* Dubois, 1932

Sahibləri: boz qaz, yaşılbaş ördək, qırmızıbaş dalğıc.

Lokallaşması: bağırsaq.

*D. chromatophorum* (Brown, 1931)

Sahibləri: gümüşü qağayı, adi qağayı, adi sterna.

Lokallaşması: bağırsaq.

*D. commutatum* (Diesing, 1850)

Sahibləri: gümüşü qağayı.

Lokallaşması: bağırsaq.

*D. rutili* Razmashkin, 1969
Sahibləri: gümüşü qağayı, adi qağayı, adi sterna.
Lokallaşması: bağırsaq.
*D. spathaceum* (Rudolphi, 1819)
Sahibləri: gümüşü qağayı, adi qağayı.
Lokallaşması: bağırsaq.
*Posthodiplostomum cuticola* (Nordmann, 1932)
Sahibləri: Misir vağı, iri ağ vağ, kiçik ağ vağ.
Lokallaşması: bağırsaq.

Təsnifat icmalında göstərilmiş trematod növlərindən *Diplostomum chromatophorum* və *D. rutili* əvvəllər Azərbaycanda balıqlarda tapılsalar da, quşlarda ilk dəfə bizim tərəfimizdən qeyd olunmuşlar.

Müxtəlif patogen trematodlar öz bioloji xüsusiyyətlərindən asılı olaraq sahiblərinin orqanizminə fərqli şəkildə təsir edirlər. Belə ki, su-bataqlıq quşlarının trematodlarının əksəriyyətindən fərqli olaraq *Strigea falconis* onların orqanizmində yalnız metaserkari mərhələsinə qədər inkişaf edir. Həmin parazit bu quşların dərialtı piy və birləşdirici toxumalarında, qida borusu və traxeyanın ətraflarında, boyun, döş, ayaq və baş əzələlərinin fassiyalarının altında lokallaşır. Axırıncı sahib olan yırtıcı quşlar bu trematodla yoluxmuş su-bataqlıq quşları ilə qidalandıqda həmin parazit onların orqanizminə düşür və bağırsağında cinsi yetkinliyə çatır. Bu parazitin metaserkariləri quşların müxtəlif toxumalarında lokallaşaraq onların zəifləməsinə, ov quşlarının və ev quşlarının ətinin keyfiyyətinin xeyli aşağı düşməsinə səbəb olur (Krone, 2008: 559-61; Olinda, Souza, Dias, Marietto-Gonçalves, Silva, Batista, 2014: 258-270).

Su-bataqlıq quşlarında parazitlik edən trematodların əksəriyyəti bu heyvanlardan axırıncı sahib kimi istifadə etdiyindən, təbii şəraitdə bir qayda olaraq quşlarda ağır xəstəliklər törətmirlər, çünki axırıncı sahibin ölümü adətən trematodun da ölümünə səbəb olur. Bununla belə bu qəbildən olan bir sıra növlərin quşlar üçün patogen olduğu məlumdur. Axırıncı sahibi su-bataqlıq quşları olan trematodlardan bu heyvanlarda xəstəlik törədənlərinin böyük hissəsi Echinostomatidae fəsiləsinə aiddir. Bu fəsilənin nümayəndələri arasında quşlarda xəstəlik törədicisi kimi ən çox tanınan *Echinostoma revolutum* növüdür. Lakin *Echinostoma* cinsinin başqa nümayəndələrinin də xəstəlik törətdiyi məlumdur. Quşların bağırsağında parazitlik edən bu trematodlar sormacları və tikanları vasitəsilə bağırsaq divarlarının selikli qişasını zədələyir və qanaxmalara səbəb ola bilir. *Echinostoma* cinsinin nümayəndələrinin törətdiyi exinostomoz xəstəliyi ev quşlarında da mühahidə olunur (Yousuf, Das, Anisuzzaman, Banowary, 2009: 91-97; Crowmik, 2013: 218-223; Goum, Rim, 2014: 215-221).

Exinostomalar insanın bağırsağında da qeyd olunur. Onun bu parazitlərlə yoluxması orqanizmində helmintin metaserkariləri olan balıq, qurbağa, xərçəng, yaxud mollyusku çiy və ya yaxud yaxşı bişməmiş şəkildə yedikdə baş verir. İnsanın mədə-bağırsaq sistemində qurdların yapışdığı yerdə selikli qişanın iltihabı və xoraların əmələ gəlməsi baş verir. Yoluxma intensivliyi çox aşağı olduqda xəstəlik insanda güclü simptomla müşaiyət olunmadan da keçə bilər. Lakin insan orqanizmində bu qurdların sayı onlarca olduqda xəstədə mədə-bağırsaq ağrıları, ishal, zəiflik və bədən çəkisinin azalması müşahidə olunur. Bu trematodun insanda törətdiyi exinostomoz xəstəliyi əsasən Cənub-Şərqi Asiyada və Uzaq Şərqdə, o cümlədən Çində, Koreyada, Tayvanda, Filippində, Malayziyada, Hindistanda yayılmışdır. Bu xəstəliyin Yaponiya, Sinqapur, Rumıniya, Macarıstan və İtaliyada da müşahidə olunması barədə məlumat vardır. *Echinostoma* cinsinin nümyəndələri insanla yanaşı və yırtıcılar dəstəsinə aid olan ev heyvanlarının (pişik, it) bağırsağında da parazitlik edə bilir (Belizario, Geronilla, Anastacio, Leon, Subaan, Sebastian, Bangs, 2007: 1130-1131; Chai, Fried, Toledo, 2009; 147-183; Woon-Mok Sohn, Jong-Yil Chai, Tai-Soon Yong, Keeseon, Eom, Cheong-Ha Yoon, Muth Sinuon, Duong Socheat, Soon-Hyung Lee, 2011: 117-119).

Notocotylidae fəsiləsinə aid olan *Notocotylus* və *Catatropis* cinslərinin nümayəndələri vəhşi su-bataqlıq quşlarında və ev su quşlarında xəstəlik əmələ gətirir. Bu helmintlərə ev toyuqlarında da təsadüf olunur. Parazitlərin inkişafı *Planorbis, Lymnaea* və *Bullinus* cinslərindən olan mollyuskların

iştirakı ilə gedir. Quşlar bu trematodların adoleskarilərini su ilə, yaxud su bitkiləri ilə birlikdə udurlar. Quşun bədəninə düşmüş notokolidlər bağırsağın selikli qişasını zədələyir və səthinin qopmasına səbəb olur, onun kor çıxıntılarında iltihab əmələ gətirir, həzm sisteminin motor və sekretor funksiyalarını pozur. Zədələnmiş yerlərdən patogen mikroblar daxil olur, parazitlərin həyat fəaliyyəti məhsulları toksikoz yaradır. Yoluxmuş quşlarda ishal, zəiflik, süstlük və hərəkətlərin yavaşıması müşahidə olunur. Xəstəlik zamanı qaz və ördək balalarının böyümə sürəti aşağı düşür, təsərrüfatlarda yumurta məhsulunun miqdarı və ət çıxımı azalır (Kodzokova, 2009: 25).

*Tanaisia fedtschenkoi* quşları intensiv yoluxdurduqda onların böyrəklərində yaxşı nəzərə çarpan patoloji dəyişikliklərə səbəb olur: böyrəklərin toxuması yumşalır və mozaik bənövşəyi-qırmızı rəng alır, sidik kanalları çox genişlənir və dənəvər kütlə ilə dolur (Unwina, Chantreyb, Chattertona, Aldhounc, Timothy, Littlewood, 2013: 32-41). Bəzən bu helmint quşların bədən boşluğunda parazitlik edərək, iltihab prosesinə səbəb olur (Sinniah,1980: 423-429).

Son zamanlar Uzaq Şərq mətbəxinin Avropada geniş yayılması ilə əlaqədar burada həmin mətbəx üçün səciyyəvi olaraq balığın və başqa su heyvanlarının çiy halda yeyilməsi halları da çox artmışdır. Bu, başqa patogen helmintlərlə bərabər *Echinostoma* cinsinə aid olan trematod növlərinin (*Echinostoma revolutum* və *E. sudanense*) də insanların orqanizminə düşmək ehtimallarını artırır (Chai, Fried, Toledo, 2009: 147-183; Ndeda, Aketch, Onyango, 2013: 1-7).

İnsan üçün təhlükəli trematodların ikinci qrupu serkariləri su heyvanlarının bədəninə aktiv daxil olan *Bilharziella* və *Strigea* cinslərinə aid növlərdir (*Bilharziella polonica* və *Strigea falconis*). Bunların serkariləri suda insana da hücum edir və onun dərisində kiçik xoralar əmələ gətirərək, qeyri-spesifik serkarioza səbəb olurlar (Akramova, Shakarboyev, Azimov, 2007: 21-22; Horak, Kolarova, Mikes, 2014: 331-364; Horak, Mikes, Lichtenbergova, Skala, Soldanova, Brant, 2015: 165-190).

Diplostomatidae fəsiləsinin metaserkari mərhələsində balıqların müxtəlif toxumalarında parazitlik edən demək olar ki, bütün nümayəndələri balıqların orqanizminə bu və ya digər dərəcədə zərər verir, yaxud onların ətinin əmtəə keyfiyyətlərini aşağı salır. Bu qəbildən olan bəzi növlər balıqlarda ağır xəstəliklər törədərək, onların kütləvi qırğınına səbəb ola bilir. Aşağıda bu növlərin törətdiyi xəstəliklər barədə məlumat verilir.

*Diplostomum commutatum, Diplosromum chromatophorum, D. mergi, D. rutil, D. spathaceum* müxtəlif balıqların diplostomozlarının törədiciləridir. Bu parazitlərin serkariləri aktiv olaraq balığın orqanizminə daxil olur, onun gözlərinin büllurlarında lokallaşaraq, metaserkarilərə çevrilir və göz büllurunun şəffaflığını itirərək tutqunlaşmasına səbəb olur. Gözün ön kamerasında sulu ekssudat toplanır, onun təzyiqi altnda gözün buynuz qişası qabarır və dombalangözlük əmələ gəlir. Parazitlərin təsirindən zədələnmiş göz bülluru çirkli süd rəngi alır, deformasiyaya uğrayır, buynuz qişasının yarılması nəticəsində büllur qopub xaricə düşür ki, bu da balığın tamamilə kor olmasına gətirib çıxarır. Bu xəstəliyə yoluxmuş balıqlar normal qidalana bilmir, zəifləyir, suyun üzünə çıxır, nəticədə ya xəstəlikdən ölür, ya da balıqyeyən quşlar tərəfindən yeyilir (Woon-Mok Sohn, Jong-Yil Chai, Tai-Soon Yong, Keeseon S. Eom, Cheong-Ha Yoon, Muth Sinuon, Duong Socheat, Soon-Hyung Lee, 2011: 117-119; Ndeda, Aketch, Onyango, 2013: 1-7; Horak, 2011: 779-790).

Maraqlıdır ki, diplostomumların balığın orqanizmində olan, lakin quşun bağırsağına düşərsə hələ onu yoluxdura bilməyən cavan metaserkariləri öz sahibinin davranışını tamamilə əks istiqamətdə dəyişdirirlər. Belə ki, göz büllurlarında bu cür metaserkarilər olan balıqlar suyun üzünə qalxmatıb dibinə enirlər, yəni balıqyeyən quşlardan uzaqlaşırlar (Seppala, Karvonen, Valtonen, 2012: 73-81).

*Posthodiplostomum cuticola* müxtəlif balıqlrın postodiplostomozunun törədicisidir. Parazitin serkarilərinin daxil olduğu yerdə balığın dərisində xırda nöqtəvi qançırlar əmələ gəlir. Tədricən dəri üzərində birləşdirici toxumadan əmələ gəlmiş içərisində parazit olan qara qabarcıqlar formasında kapsullar yaranır. Balığın qanının hemoqlobinin, piqment hüceyrələrinin və xromatoforların parçalanması nəticəsində əmələ gəlmiş hemomelonin bu kapsulun ozünə və onun ətrafında olan bütün toxumalara qara rəng verir. Bu parazitlə yoluxmuş balıq körpələrinin bədəni deformasiya olur, onurğa sütunu əyilir və elastikliyini itirir. Xəstə balıqlar zəifləyir və çox vaxt ölürlər (Ondrackova, Davidova, Gelnar, 2008: 526-529; Baranova, 2012: 24).

Bundan başqa xəstə balıqların zəifləməsi onların balıqyeyən quşlar tərəfindən ovlanmasını xeyli asanlaşdırır (Ondrackova, Jurajda, 2010: 312-125).

Qeydə alınmış trematod növləri tədqiq etdiyimiz quş növləri üzrə qeyri-bərabər paylanmışlar. Belə ki, *Strigea falconis* 12 növ quşda, *Echinostoma revolutum* 8 növ quşda, *Bilharzia polonica* 6 növ quşda, *Echinostoma sudanense, Tanaisia fedtschenkoi* və *Hysteromorpha triloba* 4 növ quşda, *Notocotylus attenuatus, Diplostomum mergi, D. chromatophorum, D. rutili* və *Posthodiplostomum cuticola* 3 növ quşda, *Catatropis verrucosa* və *Diplostomum spathaceum* 2 növ quşda, *Diplostomum commutatum* isə yalnız 1 növ quşda tapılmışdır.

Trematodların törədicilərinin ən çox parazitlik etdiyi orqan bağırsaq olmuşdur, bu orqanın boşluğunda 12 növ belə trematod qeydə alınmışdır. Bu onunla əlaqədardır ki, qeyd olunmuş növlərin böyük əksəriyyəti öz inkişafını quşlarda başa çatdırır, qalan orqanların hər birində, o cümlədən bağırsağın, qaraciyərin, ürəyin, mədəaltı vəzinin, dalağın və böyrəklərin qan damarlarında, həmçinin dəri altındakı piy toxuması və birləşdirici toxuma, qida borusunun və traxeyanın ətrafları, boyun, döş, ayaq və baş əzələlərinin fassiyalarının altında cəmi, 1 trematod növü tapılmışdır.

Tədqiq olunmuş quşlardan yaşilbaş ördək və gümüşü qağayı-6 növ, adi qağayı-5 növ, qaşqaldaq, iri ağ vağ, boz qaz və adi sterna-4 növ, kiçik maygülü, kiçik qarabattaq, iri qarabattaq və ağ qaz-3 növ, kiçik sterna, kiçik ağ vağ, iri maygülü və enlidimdik ördək-2 növ, Misir vağı, qirmizibaş dalğıc, caydaq cüllüt və boz vağ-1 növ patogen trematoda yoluxmuşdu. Qaranaz və çibisdə patogen trematodlar qeyd olunmamışdır.

Trematodların böyük əksəriyyəti su-bataqlıq quşlarını metaserkarilərlə yoluxmuş ikinci aralıq sahibləri yeyərkən yoluxdurur. Trematodların kiçik bir qrupu olan Ornithobilharziidae və Strigeidae fəsilələrinin nümayəndələri olan 5 növ bu barədə istisna təşkil edirlər. Onlar serkari mərhələsində birinci aralıq sahibləri olan mollyuskların bədənindən çıxıb suya düşür və burada su-bataqlıq quşlarının dərisini deşərək, aktiv surətdə onların orqanizminə girirlər. Bununla belə bu parazitlərlə də yoluxma dolayı yolla bu və ya digər dərəcədə quşların qidalanması ilə əlaqədardır, çünki su bitkiləri ilə qidalanaraq, mollyuskların çoxsaylı olduğu məkana çox daxil olan quşların bunlarla yoluxma ehtimalı adətən başqalarınkından daha yüksəkdir.

## Nəticə

Beləliklə, 2021-2023-cü illərdə Azərbaycan Respublikasının Araz çayı sahili ərazilərində 21 növə aid olan 128 ədəd su-bataqlıq quşun tam helmintoloji yarma üsulu ilə tədqiq olunması nəticəsində 63 növ trematod tapılmışdır ki, bunlardan 2 növ Azərbaycan faunası üçün ilk dəfə olaraq müəllif tərəfindən göstərilmişdir. Aşkara çıxarılmış trematodlardan 13 növ epizootoloji və ya epidemioloji əhəmiyyətə malikdir. Bunların əksəriyyəti quşların bağırsağında parazitlik edir, digər orqanların hər birində cəmi bir patogen trematod növü tapılmışdır. Əldə edilmiş trematodlardan 6 növü quşlarda, 6 növü isə balıqlarda xəstəlik törədir, 1 növ quşlarla xəsrəlik törətməklə yanaşı həm də insanın və yırtıcı ev heyvanlarının bağırsaq parazidir, quşlar üçün təhlükəli olan 2 növün serkariləri suda insana da hücum edib qeyri-spesifik serkarioza səbəb olur.

## Ədəbiyyat

1. Vahidova, S.M. (1978). Gelminty ptits Azerbaydzhana. Baku: Elm, 238 s.
2. Dorovskikh, G.N., Stepanov, V.G. (2009). Metody sbora i obrabotki parazitologicheskikh materialov (uchebnoye posobiye). Syktyvkar: Izd-vo Syktyvkarskogo un-ta, 131 s.
3. Krone, O. (2008). Strigea falconis in Eurasian Buzzards from Germany. J. wildlife diseases, vol. 44(3), pp.559-61.
4. Crowmik, M.K. (2013). Enteric diseases in ducks (Anas platyrhynchos domesticus). Indian Veter. Med. J., pp.218-223.
5. Mustafayev, Q.T. (2004). Quşlar – Aves. Azərbaycanın heyvanlar aləmi. Onurğalılar, c. 3. Bakı: Elm, s.261-411.

6. Mustafayev, Q.T. (2004). Azərbaycanın ornitofaunasının taksonomik spektri. Bakı: BDU nəşriyyatı, 35 s.
7. Mustafayev, Q.T., Sadıqova, N.A. (2005). Azərbaycanın quşları. Bakı: Çaşıoğlu, 419 s.
8. Tuayev, D.Q. (1996). Azərbaycan quşlarının kataloqu. Bakı: Şur, 240 s.
9. Dubinina, M.N. (1971). Parazitologicheskoye issledovaniye ptits. L., 140 s.
10. Pronina, S.V., Pronin, N.M. (2007). Metodicheskoye posobiye po gidroparazitologii (Chast 1. Texnika parazitologicheskikh issledovaniy). Ulan-Ude, 52 s.
11. Bykhovskaya-Pavlovskaya, I.Y. (1962). Trematody ptits fauny SSSR (ekologigeograficheskiy obzor). M.L.: Izd. AN SSSR, 407 s.
12. Gayevskaya, A.V., Gusev, A.V., Delyamure, S.L., Donets, Z.S., Iskova, V.V. (1975). Opredelitel parazitov pozvonochnykh Chernogo i Azovskogo morey. Kiyev: Naukova dumka, 552 s.
13. Olinda, R.G., de Souza, M.C., Dias, G.F., Marietto-Gonçalves, G.A., da Silva, Batista, R.J. (2014). Digenean fauna in raptors from northeastern Argentina, with the description of a new species of Strigea (Digenea: Strigeidae). Zootaxa, vol. 37. № 3, pp.258-270.
14. Yousuf, M.A., Das, P.M., Anisuzzaman, M., Banowary, B. (2009). Gastro-intestinal helminths of ducks: Some epidemiologic and pathologic aspects. J.Bangladesh Agricult. Univ., vol. 7, pp.91-97.
15. Goum, P.S., Rim, H.J. (2014). A study on the parasitic helminths of domestic duck (Anas platyrhynchos var. domestica Linnaeus) in Korea. Korean J.Parasitol, vol. 52, pp.215-221.
16. Belizario, V.Y., Geronilla, G.G., Anastacio, M.B., de Leon, W.U., Subaan, A.U., Sebastian, A.C., Bangs, M.J. (2007). Echinostoma infection in the Philippines. Emerg. Infect. Dis., vol. 13, pp.1130-1131.
17. Chai, J.Y., Fried, B, Toledo, R. (2009). Echinostomes in humans. The Biology of Echinostomes. New York, Springer, pp.147-183.
18. Woon-Mok Sohn, Jong-Yil Chai, Tai-Soon Yong, Keeseon S. Eom, Cheong-Ha Yoon, Muth Sinuon, Duong Socheat, Soon-Hyung Lee. (2011). Echinostoma revolutum infection in Children, Pursat Province, Cambodia. Emerg Infect Dis. Jan; 17(1), pp.117-119.
19. Kodzokova, E.Kh. (2009). Ekologo-epizootologicheskaya otsenka notokotilidozov vodoplavayushikh ptits v regione Tsentralnogo Kavkaza i razrabotka metodov regulyatsii chislennosti trematod: Avtoref. diss. … kand. biol. nauk. Makhachkala, 25 s.
20. Unwina, S., Chantreyb, J., Chattertona, J., Aldhounc, J.A., Timothy, D. Littlewood, J. (2013). Renal trematode infection due to Tanaisia fedtschenkoi in zoo housed Columbiformes and a red bird-of-paradise (Paradisaea rubra). Intern. J. Parasitol.: Parasites and Wildlife, vol. 2, pp.32-41.
21. Sinniah, B. (1980). Tanaisia fedtschenkoi from body cavity of Gallus gallus. Southeast Asian J.Trop. Med. Public Health, vol. 11(3), pp.423-429.
22. Ndeda, V.M., Aketch, B.O., Onyango, D.M. (2013). Effect of Diplostomum species on length–weight relationship of farmed nile tilapia in Kibos Area, Kisumu City, Kenya. Fisheries and Aquaculture Journal, vol. 60, pp.1-7.
23. Akramova, F.D., Shakarboyev, E.B., Azimov, D.A. (2007). Sovremennoye sostoyzniye epizootologii i epidemiologii bilgartsiozov jivotnykh i cheloveka. Vestnik vracha. № 2, s.21-22.
24. Horak, P., Kolarova, L., Mikes, L. (2014). Schistosomatoidea and Diplostomoidea. Digenetic Trematodes. Advances in exper. Med. and biol., vol. 766, pp.331-364.
25. Horak, P., Mikes, L., Lichtenbergova, L., Skala, V., Soldanova, M., Brant, S.V. (2015). Avian schistosomes and outbreaks of cercarial dermatitis. Clinical Microbiology Reviews, vol. 28, pp.165-190.
26. İbragimov, Sh.R. (2012). Parazity i bolezni ryb Kaspiyskogo morya (ekologo-geograficheskiy analiz, epizootologicheskaya i epidemiologicheskaya otsenka). Baku: Elm, 400 s.

27. Sitko, J., Rząd, I. (2014). Diplostomum and Ornithodiplostomum scardinii (Diplostomidae, Digenea) species from naturally infected birds (Anatinae) in the Czech Republic and in Poland: morphological, morphometric and ecological features. Helminthologia, vol. 51. № 3, pp.215-224.
28. Horak, P. (2011). Snails, waterfowl and cercarial dermatitis // Freshwater Biology, vol. 56, pp.779-790.
29. Seppala, O., Karvonen, A., Valtonen, E.T. (2012). Behavioural machanisms underlying ‘specific’ host manipulation by a tropically transmitted parasite. Evolutionary Ecology Research, vol., 14, pp.73-81.
30. Ondrackova, M., Davidova, M., Gelnar, M. (2008). Susceptibility of Prussian carp infected by metacercariae of Posthodiplostomum cuticola (Nordmann, 1832) to fish predation. Ecological Research, Japan: Springer Japan, vol. 23. № 4, pp.526-529.
31. Baranova, N.V. (2012). Ekologo-biologicheskiye osobennosti Posthodiplostomum cuticola i postodiplostomoz ryb v usloviyakh Tsentralno-Chernozyomnoy zony (na primere Kurskoy oblasti): Avtoref. diss. … kand. bio. nauk. Kursk, 24 s.
32. Ondrackova, M., Jurajda, P. (2010). Susceptibility of fish infected by metacercariae of Posthodiplostomum cuticola (Nordmann, 1832) to fish predation. Ecological Research, Japan: Springer Japan, vol. 25. № 3, pp.312-125.

Göndərilib: 05.08.2023 Qəbul edilib: 18.09.2023

## İÇİNDƏKİLƏR

### HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR

### HUMANITIES AND SOCIAL SCIENCES



### TƏBİƏT ELMLƏRİ

### NATURAL SCIENCES

